be presented here, as well as video links to YouTube with interviews of people`s artists of Azerbaijan such as Alibaba Mammadov, Nariman Azimov and Siyavush Kerimi.

A.Asgarov perfectly mastered the *clarinet* and knew the technical and musical capabilities of national wind instruments such as *balaban*, *zurna (surna)*, *ney (nay)* and *tutek*. It was the deep knowledge of the performing capabilities of the folk wind instruments of Azerbaijan that made it possible to create his own clarinet and make changes to the development of performing qualities on this instrument. The changes introduced by Asgarov when creating his clarinet were noticeably reflected in the sound and size of all the components of the instrument.

The clarinet of the «As» system made by Asgarov will be presented in comparison with European instruments of the German «A» and French «B» systems. All photos are taken from original instruments owned by Alakbar Asgarov.

***Keywords:*** *Azerbaijan, Alakbar Asgarov, clarinet, Europe, development, performer, innovation*

## Giriş

Musiqi sənətinin təkmilləşməsində çalğı alətlərinin rolu mühümdür və müxtəlif növlərin vasitəsi ilə icra olunur. Biri-birindən fərqli və xarakterik səslənən musiqi obrazlarının yaranması çalğı alətlərinin bədii və texniki imkanlarından asılıdır.

Qədim zamanlarda olduğu kimi, müasir dövrümüzdə də musiqi alətlərinin təkmilləşdirilməsinə dair diqqət yetirilir və yeni növləri yaradılır. Bakı Musiqi Akademiyası, Azərbaycan Milli Konservatoriyası və İncəsənət Gimnaziyasının tərkibində fəaliyyət göstərən emalatxanalarda qədim alətlərin bərpası üzrə səmərəli işlər görülür. Məqalənin birinci hissəsinə dair *klarnet*in yaranma tarixinə bir nəzər yetirək.

*Klarnet* (*Clarinet*) – nəfəs ilə çalınan alətlər qrupuna aid edilir. Eyni çalğı üslubuna malik olan *klarnet* alətləri – tembr və adları ilə fərqlənirlər. İtalyanca – *"clarnetto"*, almanca – *"clarinette"*, fransızca – *"clarnet"*, ingiliscə – *"clarionet"* adlara malik olan bu alətlər tək qamışlı və sərt ağac növlərindən (qoz, tut, ərik) hazırlanır.

İlk *klarnet* nümunələrindən biri *"clarino"* adlanan alət trubanın tembrinə bənzəyirdi. Latınca *"clarus"* – aydın, təmiz səsə malik olan və yüksək registrli truba aləti deməkdir. Bəzi ensiklopedik əsərlərdə alətin ixtira dövrü XVI əsrin sonu (1690 il), bəzilərində isə XVII əsrin əvvəllərinə (1710 il) aid edilir.

Alman ustası Genrix Denner 1666-cı ildə ailəsi ilə birlikdə Nünberq şəhərinə köçür və 1678-ci ildə nəfəs çalğı alətlərinin hazırlanmasına dair ilk fabrikasını açır. Sonraki illərdə Nünberqli usta İoqan Denner (1655–1707) atası Genrix Dennerin sənət yolunu davam edərək köhnə fransız nəfəs çalğı aləti *"chalumeau"* (*şalümo*) üzərində çalışır, onun dizaynını təkmilləşdirərək *klarnetin* yaranma ideyasını həyata keçirir.

*Chalumeau* (*şalümo*) – bu alət 7 dəlikdən ibarət və bir oktav diapazonlu idi. *Chalumeau* və *klarnet* arasında aydın fərq qoymağa imkan verən əsas yenilik, alətin arxasındakı sol əlin birinci barmaq vasitəsi ilə ikinci oktavanın notlarına keçid yaradan klapan qoyulmuşdur. Bir müddət *chalumeau* və klarnet bərabər şəkildə istifadə edilirdi, lakin XVIII əsrin ikinci rübündə *chalumeau* aləti musiqi ifaçılığı praktikasından çıxarıldı. Sonralar İoqan Dennerin işini oğlu Yakob (1681–1735) davam etdirdi və hazırladığı üç alət – Nünberq, Berlin və Brüssel muzeylərində indiyədək qorunub-saxlanılır. Bu klarnet alətlərinə iki klapan məxsusdur. Sonralar isə iki klapanın mövcudluğuna baxmayaraq, avstriyalı usta Pauer 1760-cı ildə üçüncü klapanı əlavə edir, belçikalı usta Rotterburq dördüncünü, 1785-ci ildə ingiltərəli Con Hale beşincini və nəhayət 1790-cı ildə məhşur klarnet ifaçısı və bəstəkar Jan-Ksavye Lefebr klarnetin klassik modelini yaradaraq altıncı klapanı əlavə edərək altı klapanlı klarnet hazırladı (1).

*Klarnet* alətinin adı – latın sözündən yaranıb. *Karlos* – aydın səs deməkdir. XVIII əsrin əvvəllərində klarnet aləti imkanlarına görə artıq *chalumeau* (*şalümo*) alətini tam əvəz edə bilmiş və artıq 1750-ci ildə təkmilləşdirilmiş konstruksiyada müxtəlif orkestrlərin tərkibinə daxil edilmişdir.

1800-cü ildən etibarən klarnetin kamera orkestrlərinə daxil edilməsinə dair Volqanq Amodey Motsartın böyük rolu olmuşdur və o, bəstələdiyi Konsert əsərlərinə klarnet partiyalarını daxil etmişdir.

Bu alət XVIII əsrin ikinci yarısından musiqi janr və kompozisiyalarında istifadə olunur: solo ifaçılığında, kamera ansambllarında, simfonik və caz orkestrlərində, eyni ilə xalq musiqisində. Klarnet aləti geniş diapazona, yumşaq tembrə malikdir və ifaçının qarşısında geniş ekspressiv imkanlar yaradır.

XVIII əsrin sonralarından klarnet klassik musiqinin əsas alətlərindən birinə çevrildi. Elə virtuoz ifaçılar var ki, onlar klarnetin ifa texnikasından əlavə onun dizaynında da dəyişikliklər edə bilmişlər. Onların arasında tembrə əhəmiyyətli dərəcədə təsir edən, üfürülməni sadələşdirən və alətin diapazonunu genişləndirən, onun yeni modelini yaradan ağızlığın dizaynını dəyişdirən İvan Mülleri qeyd etmək lazımdır. Elə bu vaxtdan da klarnetin "qızıl dövrü" başlayır.

*Klarnetin* təkmilləşdirilməsi XIX əsrə qədər davam etdi. Paris Konservatoriyasının professoru Hyacinthe Klose və usta Louis-Auguste Buffet tərəfindən ixtira edilmiş üzük klapan sistemini uyğunlaşdırdılar. Münhenli *fleyta* ifaçısı Teobald Böhn əvvəlcə yalnız *fleytada* istifadə edirdi və sonra bu model *"Fransız klarneti"* adlandırıldı. *Klarnetin* dizaynının təkmilləşdirilməsində başqa görkəmli ustalar da iştirak etmişdir və onların arasında *saksafon* ixtiraçısı Adolf Saksın adını çəkə bilərik. Almaniya və Avstriyada – *"Alman"* və *"Avstriya"* adlanan *klarnet*lər geniş yayılmışdır. Bu alətlər *"Klarnet Məktəbi"* kitabının müəllifi Johann Georg Ottenştayner (1815−1879) və *klarnet* ustası Karl Berman ilə birlikdə düzəltdikləri klapan sistemli alətlərindən hazırlanmışdır. 1900-cü illərdə Berlin ustası Oskar Oehler (1858−1936) tərəfindən bu sistem təkmilləşdirilmişdir. Həmin sistem ənənəvi olaraq "Ehler sistemi" adlandırılmışdır. Alman klarnetlərinin mexanizmi fransız alətlərindən fərqlənir və səlis virtuoz ifa üçün daha az uyğundur. Bu klarnetlərin ağızlıqları və qamışları da fransız texnologiyalarından fərqli vasitə ilə hazırlanır. Bununla belə, alman sisteminin alətləri daha çox ifadəlilik və səs gücünü təmin etdiyinə əsasən inanılır (2). Uzun müddət ərzində alman sistemli klarnetlər bütün dünyaya yayıldı, lakin 1950-ci illərdən təxmin edilərək musiqiçilər fransız sistemli klarnetlərinə keçid aldılar. Alman sistemli klarnetlər indi yalnız Avstriya, Almaniya və Hollandiyada istifadə edilir.

Müxtəlif dizaynerlərin eksperimental nümunələri arsında müasir musiqinin ifası üçün nəzərdə tutulmuş Fritz Schüllerin dörddəbir tonlu (¼) klarnetini qeyd etmək lazımdır.

Artıq XIX əsrin axırlarından etibarən klarnet aləti klassik musiqi əsərlərinin səslənməsində bənzərsiz rol oynayır. Bu alət simfonik və kamera orkestrlərinə daxil edilərək, solo ifaları üçün geniş imkanlar yaradır. Məsələn, görkəmli Azərbaycan bəstəkarı Fikrət Əmirovun "Kürd Ovşarı" simfonik muğamı əsərində klarnetin solo partiyası insan ruhunu duyğulandırır (3).

*"Nəfəs çalğı alətləri Azərbaycanda çox qədimdən mövcud olaraq istifadə edilsə də, hətta kökü eramızdan əvvəl VI minilliyə gedib çıxsa da, milli klarnet sənəti ifaçılığı bizdə XX əsrin 10-cu illərindən başlayır. Nəfəs çalğı alətləri ifaçılarımız Rusiyadan Azərbaycana gətirilməsi zamanı buna maraq, həvəs göstərərək öyrənmək istəyində olublar. 1920-ci ildən sonra ölkəmizin musiqiçiləri arasında klarnet ifaçılığına meyl daha da artıb" (4).*

Müasir dövrümüzə qədər klarnet müxtəlif inkişaf yolları keçərək konstruktiv dəyişikliklərə məruz qalmışdır və zaman keçdikcə alətin yeni növləri yaradılır. Qədim zamanlarda bu alət sərt ağac növündən düzəldilib, lakin müasir dövrümüzdə ebonit və metaldan hazırlanan klarnet nümunələrinə rast gələ bilirik.

*Klarnet* – qamış müştüklü, silindr şəkilli boru formasında və klapanlar sistemi ilə təciz olunan bir alətdir. Bu alət çoxlu sayda klapanlar vasitəsi ilə çalınır. *Klarnet*in tembri registr quruluşuna görə 3 hissəyə bölünür:

1) aşağı registr – tutqun;
2) orta registr – mülayim ifadəli;
3) yuxarı registr – işıqlı və cingiltili.

*Klarnet* – transpozisiylı musiqi alətləri qrupuna aiddir. Adətən orkestr və ansambllarda "in A" və "in B" kökündə olan klarnetlərdən istifadə edilir, lakin buna baxmayaraq bu alət böyük bir ailəyə malikdir və bir çox bənzər növləri mövcuddur:

1. *"C" soprano klarnet*. Bu alətin diapazonu – kiçik oktavanın *mi* notundan 3-cü oktavanın *lya* səsinə kimidir;
2. *"D" soprano klarnet*. Bu alət kiçik *klarnet*lər qrupuna daxildir və not yazılışına əsasən böyük sekunda (b.2) aralığı ilə fərqli səslənir. *"D" klarnet* növü simfonik orkestrlərdə nadir hallarda istifadə olunur. Səs diapazonu – kiçik oktavanın *fa diyez* səsindən 3-cü oktavanın *lya diyez* səsinə kimi istifadə olunur;
3. *"Es" kiçik klarnet.* Alman sisteminə məxsus kiçik həcimli bu *klarnet* transponizə olunan alətlərdəndir. Bu alət başqa *klarnet*lərdən yazılan notlara əsasən kiçik tersiya (k.3) aralığı ilə yuxarı səslənir və bu səbəbdən fərqlidir;
4. *"As" piccolo klarnet.* Alman istehsalı olan "As" kökünə malik olan bir alət nadir və kiçik *klarnet*lər qrupuna daxildir. Bu alətin diapazonu 1-ci oktavanın *do* səsindən 4-cü oktavanın *mi bemol* səsinə qədərdir;
5. "*Es*" və "*F*" *alto klarnet*lər. Səs diapazonu – böyük oktavanın *sol* səsindən 2-ci oktavanın *sol* səsinə qədərdir;
6. "*A*" və "*B*" *bass klarnet*lər.

Bu klarnetlərin diapazonu aşağı registrdə və kontroktavanın re bemol səsindən 1-ci oktavanın re səsinə qədərdir. Bütün klarnet növlərini birləşdirən bir xüsusiyyət var ki, onların hamısı eyni ifa tərzinə malikdir. Qısa bir müddətdə başqa növlərinə də öyrəşdikdən sonra yaxşı çalmaq mümkündür. Onu da qeyd edək ki, orkestrdə 4 növü davamlı olaraq istifadə olunur:

1. "E" düz kiçik klarnet;
2. "B" düz klarnet;
3. "A" klarnet;
4. "B" düz bas klarnet.

"A" sistemli alət – "B" *düz klarnet*inə çox yaxındır. Bu klarnetlər digər növlərindən fərqli olaraq dünyanın bir çox ölkəsində istifadə olunur. "A" sistemli alət ölçülərinə əsasən "B" düz klarnetdən bir qədər uzundur və tembrinə görə daha tünd səsə malikdir. Səs genişliyi və ifaçılıq baxımından hər iki alət biri-birinə çox bənzərdir. Bəstəkarlar öz yaradıcılıqlarında bu iki klarnet növünün birindən istifadə edirlər.

Ələkbər Əsgərovun düzəltdiyi klarnet – uzunluq, sistem və kök quruluşu baxımından mövcud olan alətlərdən fərqlididr. Bu fərqlilikləri orijinal alətlərdən alınan fotolarla təqdim edirik:



**Şəkil 1.**
**1-ci "B" fransız sistemli, 2-ci "A" alman sistemli, 3-cü "As" Ələkbər Əsgərovun düzəltdiyi klarnet**

**Alman sisteminə aid "A" klarnetin hissələrinin uzunluğu**



**Şəkil 2.**
**"A" I hissə 27,8 sm**



**Şəkil 3.**
**"A" II hissə 26 sm**



**Şəkil 4.**
**"A" III hissə 11 sm**

**Fransız sisteminə aid edilən "B" klarnetin uzunluq quruluşu**



**Şəkil 5.**
**"B" I hissə 25,5 sm**



**Şəkil 6.**
**"B" II hissə 24,3 sm**



**Şəkil 7.**
**"B" III hissə 11 sm**

**Ələkbər Əsgərovun düzəltdiyi "As" sistemli klarnetin uzunluq ölçüləri**



**Şəkil 8.**
**"As" I hissə 29 sm**



**Şəkil 9.**
**"As" II hissə 28 sm**



**Şəkil 10.**
**"As" III hissə 11,6 sm**

Ə.Əsgərov ifa etdiyi milli musiqilərimiz digər azərbaycanlı ifaçılarından hazırladığı alətin kök və tembrinə görə fərqli səslənir (5).

Sənətkar milli alətlərimiz olan – *balaban, zurna, tütək* və *neyin* çalğı xüsusiyyətlərini klarnet üzərində tədbiq etmişdir. Ə.Əsgərov üçün klarnet ifaçılığında əsas xüsusiyyətlərdən biri milli alətimiz balabana xas olan nəfəsin düzgün alınması və paylaşım edilməsi idi (6).

Azərbaycanın görkəmli bəstəkarları Fikrət Əmirov və Süleyman Ələsgərov, xalq artistləri Əlibaba Məmmədov (7), Rafiq Babayev (8), Nəriman Əzimov (9) və Siyavuş Kəriminin (10) dəyərli fikirləri müxtəlif kitab və qəzet müsahibələrində, YouTube kanalında öz şərhini tapır.



**Şəkil 1. Ə.Əsgərov**
**hərbi qulluqda**



**Şəkil 2. Soldan Babayev R., sağdan Əsgərov Ə.**


ƏSGƏROV

ИФАЧЫЛАРЫМЫЗЫН ПОРТРЕТИ

Сәнәтинин вурғуну

Вағзалы чалыныр. Кларнетин сәси санки әтрафдакылары соргу-суала тутур. Көзләрдә әфсанәли, нағыллы бир мәһәббәт дүнјасы чаклаҗыр. Вағзалы чалыныр. Ады гәдим олмаса да сәдасында, нәфәсиндә бир улулуг, бир мүгәддәслик дујурсан. Бу рәгсин е'чазкар сәдасы һансы кәнчин гәлбини риггәтә кәтирмир? Ким бу һаванын сеһри алтында өмрүнүн ән хош дәгигәләрини јада салмыр?

Вағзалынын ән мәшһур ифачыларыны бармагла сајмаг олар. Пешәкар мусигичиләрин фикринчә кларнет чалан Әләкбәр Әскәров «Вағзалы», «Тәрәкәмә», «Газағы» рәгсләринин

Ә. Әскәров јарадычы сәнәткардыр. О, һәм дә бир сыра рәгсләрин мүәллифидир. «Маралы», «Меһрибаны», «Натаваны», «Расими» ојун һаваларымыз онун бармагларынын сеһриндән јараныб. О. А... бајчан мугамларынын ...

**Şəkil 3. AzTV-nin 80-ci illərin proqram səhifəsi**



**Şəkil 4. Soldan Behbudov R., sağdan Əsgərov Ə.**

Azərbaycanın Xalq Artisti, bəstəkar, pianoçu Rafiq Babayev sənətkar Ə.Əsgərov haqqında qəzet müsahibələrinin birində qeyd etmişdir: *"İngiltərədə konsertlərin birində maestromuz Rəşid Behbudov gurultulu alqışlarla təkrar-təkrar səhnəyə olunduqdan, bir balaca dincəlsin deyə mənə işarə elədi ki, instrumental heyət keçid musiqi ilə tamaşıçıları feyziyab etsin. Mən Ələkbərdən xahiş etdim ki, istədiyi muğam üzərində gəzişsin, ansambl da onu heç bir hazırlıqsız, bədahətən müşayiət edəcək. Ələkbər Əsgərov "Bayatı-Şiraz" ahəngində elə nəfəslər elədi ki, salon onu ayaq üstə alqışladı. Gözləri sevincdən dolmuş maestro və ansamblın üzvləri ona heyranlıqla baxır, əl çalır, "Əhsən! Əhsən! Əhsən!" deyirdik ..."*.

Azərbaycanın tanınmış musiqişünası Əhsən Rəhmanlının Ə.Əsgərovun klarnet ifaçılığına dair bir neçə misralarını təqdim edək:

"Klarnet sənəti bizdə gözəldi,
İllər ötüb, milli üslub yaranıb (11),
Bu alət çoxdandır, bizdə özəldi,
Zəngin ifalarla sənət varlanıb.
Adını yazdın tarixə, Ələkbər,
Məktəbini yaratdın, oldun rəhbər,
Səndən sonra ardıcıllar səfərbər,
Bu uğurlu ifa yolun yaşanıb.
Rəşid Behbudovla dünyanı gəzdin,
Oxuduğu nəğmələri bəzədin,
Birlikdə olmaqdan ilham alırdı,
Hər dəfə çalqınla öndə dayandın...".

Ələkbər Əsgərovun klarnet ifaçılığı haqqında bir çox sənət xadimləri öz fikirlərlərini müsahibələrində söyləmişlər, lakin bir məqalədə bu fikirləri qeydə almaq mümkün deyil. Tanınmış musiqiçilərin fikirlərinə diqqət yetirərməklə yanaşı, Ə.Əsgərovun özünəməxsus ifalarını da dinləmək vacibdir. Yetər ki, onun ifasında Azərbaycanın qədim və sevilən *"Şalaxo"* (*Shalakho*) rəqsinə diqqət yetirək (12).

## Nəticə

Ələkbər Əsgərov yaradıcılığı bu gün musiqi kamilliyinin ən yüksək etalonu hesab edilə bilər. Neçə onilliklər boyu ifaçı və müəllim vəzifəsində fəaliyyət göstərmiş dahi ustadın Azərbaycan xalq musiqi sənətində yeri şərəflidir. Professional musiqiçilərin fikrincə, Ə.Əsgərov Zaqafqaziya dövlətləri arasında klarnet alətində ən virtuoz ifaçılardan biri olmuşdur.

## Ədəbiyyat


1. "Zaman perspektivində klarnet". (2003). Alphonse Leduc Kataloqu.
2. Chulaki, M.I. (2005). "Instrumenty simfonicheskogo orkestra". Sankt-Peterburg, Kompozitor.
3. http://www.youtube.com/@fikretamirov6265 Fikrət Əmirov – "Kürd Ovşarı".
4. Azəri, L. (2012). "Mədəniyyət" qəzeti, 15 avqust, s.12.
5. https://www.youtube.com/watch?v=Cs7dovLk_6A
6. https://www.youtube.com/watch?v=ChfOQ3JhLOg
7. http://www.youtube.com/@ALEKPERASKEROV. Ə.Əsgərov haqqında xalq artisti Əlibaba Məmmədov.
8. Babayev, R. (1974). "İngiltərə səfərlərindən birində Ə.Əsgərov haqqında xatirələr". Qəzetdən çıxarış.
9. http://www.youtube.com/@ALEKPERASKEROV. Ə.Əsgərov haqqında xalq artisti Nəriman Əzimov.
10. http://www.youtube.com/@ALEKPERASKEROV. Ə.Əsgərov haqqında xalq artisti Siyavuş Kərimi.
11. https://www.youtube.com/watch?v=z8MMwCYZ0NY
12. http://www.youtube.com/@ALEKPERASKEROV. Azərbaycan xalq rəqsi "SHALAKHO". İfa edir Ə.Əsgərov (klarnet).


**Rəyçi: s.e.d. Abbasqulu Nəcəfzadə**

Göndərildi: 14.12.2022 Qəbul edildi: 09.02.2023

DOI: https://doi.org/10.36719/2663-4619/88/41-45

**Sevda Axundova**
Xəzər Universiteti
dissertant
sevda.app@gmail.com

# PEDAQOJİ KADR HAZIRLIĞINDA TƏLİMİN KEYFİYYƏTİNİN YÜKSƏLDİLMƏSİ ŞƏRTLƏRİ

**Xülasə**

Ümumtəhsil məktəblərində təhsilin keyfiyyətinin inkişafı sahəsində nailiyyətlər əldə etmək gələcək müəllimlərin yaxşı hazırlığından asılıdır. Müəllif pedaqoji kadrlar hazırlayan kolleclərdə keyfiyyəti təmin edən tədris texnologiyaları, yaradıcılıq potensialının inkişafı üçün müasir təhsil mühitinin yaradılmasının zəruriliyini təqdim edir.

Məqalədə Azərbaycanda müəllim hazırlığı sisteminin müasirləşdirilməsi, xüsusilə fasiləsiz təhsil sisteminin tətbiqi qeyd edilib, ixtisaslı müəllimlərin səmərəli hazırlanmasına şərait yaradan aparıcı amillər müəyyən edilib.

Müəllif qeyd edir ki, peşəkar müəllimlər hazırlamaq istəyiriksə, müasir dərsin qurulmasında və keçirilməsində əsas diqqət gələcək müəllimlərin müstəqil idrak fəaliyyətinin təşkilinə və yaradıcı potensialının inkişafına yönəldilməlidir. Bu kontekstdə məqalə müəllifi müəllim hazırlığı sisteminin inkişafı və faktiki vəziyyəti yaxşılaşdırmaq üçün bəzi tövsiyə və təkliflər verməyə çalışıb.

***Açar sözlər:*** *pedaqoji ixtisaslı kadr, təhsil, keyfiyyət, peşəkarlıq, yeni innovasiyalar*

**Sevda Akhundova**
Khazar University
dissertatist
sevda.app@gmail.com

## Conditions for improving the quality of teaching staff preparation

**Abstract**

Achieving achievements in the field of development of the quality of education in secondary schools depends on the good preparation of future teachers. The author presents the need to create a modern educational environment for the development of quality teaching technologies and creative potential in colleges that prepare pedagogical personnel.

The article mentions the modernization of the teacher training system in Azerbaijan, especially the introduction of the continuous education system, and identifies the leading factors that create conditions for the effective training of qualified teachers.

The author notes that if we want to prepare professional teachers, the main attention in the construction and conduct of modern lessons should be focused on the organization of independent cognitive activity of future teachers and the development of their creative potential. In this context, the author of the article tried to give some recommendations and suggestions for the development of the teacher training system and to improve the actual situation.

***Keywords:*** *pedagogically qualified staff, education, quality, professionalism, new innovations*

## Giriş

Pedaqoji kadrların hazırlanması mürəkkəb məsələdir. Bütün növ təhsil müəssisələri üçün pedaqoji kadrların hazırlanması müvafiq ali və orta ixtisas təhsili müəssisələri tərəfindən həyata keçirilir. Müasir tələblər fonunda məzunlarımızın iqtisadi və sosial həyatda uğurlu iştirakını təmin etmək üçün orta ixtisas təhsilinin daha sürətli inkişaf tempinin zəruriliyi danılmazdır. Cəmiyyətdəki sosial dəyişikliklər müəllim hazırlığının bəzi aktual problemlərinin həllini tələb

edir. Əsas vəzifə ümumi orta təhsilin strukturunun müasirləşdirilməsi və məzmununun yenilənməsi fonunda gələcək müəllimin peşə-pedaqoji hazırlığı üçün təşkilati-metodiki şəraitin yaradılmasıdır.

Peşəkar tələblərin dinamik artması mütəxəssis hazırlığına fərqli yanaşma, insana fərqli yanaşma ehtiyacına gətirib çıxarır. Bu gün cəmiyyətə ölkənin sosial və iqtisadi inkişafında öz sözünü deməyi bacaran rəqabət qabiliyyətli pedaqoji kadrlar lazımdır.

Azərbaycan Respublikasının "Təhsil haqqında" Qanunun 9-cu maddəsində Təhsil müəssisəsində kadr hazırlığının keyfiyyət səviyyəsi aşağıdakı kimi öz əksini tapır: “Məzunların milli və beynəlxalq əmək bazarında rəqabət qabiliyyəti, ölkənin sosial və iqtisadi inkişafında rolu ilə müəyyən edilir” (“Təhsil haqqında” qanun, 2012: 5).

Deməli, təhsilin keyfiyyəti yalnız görülən işlərin nəticələri deyil, həm də tələbələrin hərtərəfli şəxsi və sosial inkişafını təmin edən sistemdir, təşkilatdır.

XXI əsrin mütəxəssisindən bir çox qabiliyyətlər tələb olunur: özünütəhsil qabiliyyəti və öz seçimini irəli sürmək, müdafiə etmək; mübahisə etmək bacarığı; öz hərəkətlərinə görə məsuliyyət daşımaq; ünsiyyət bacarıqlarına və münaqişə vəziyyətlərini həll etmək bacarığına sahib olmaq; insanları olduğu kimi qəbul etmək bacarığı və s. Bununla yanaşı, gələcək mütəxəssisin peşəkar əhəmiyyətli keyfiyyətləri ilə yanaşı, yaradıcı təşkilatçılıq, kommunikativ qabiliyyət və bacarıqlarının inkişafı böyük əhəmiyyət kəsb edir ki, bu da məzunlarımızın rəqabətə davamlı və peşəkar kadrlar olmasına imkan verəcəkdir.

Bütün tarixi dövrlərdə görkəmli şəxsiyyətlər müəllimlik peşəsinə yüksək qiymət vermiş və müəllimliyi cəmiyyətin ən şərəfli peşəsi hesab etmişlər. Ulu öndər Heydər Əliyev də müəllimlik adını çox yüksəkdə tutmuş, onu ən vaçib peşə kimi qiymətləndirmişdir: “...hər bir müəllim bilməlidir ki, onun üzərinə düşən vəzifə, onun dövlət üçün, millət üçün, Azərbaycan xalqı üçün gördüyü iş bütün başqa sahələrdə fəaliyyət göstərən insanların hamısının işindən ən gərəklisidir, ən lazımlısıdır” (Əliyev, 2002: 139). Bu müqəddəs peşənin nüfuzunun qalxması isə keyfiyyətli təhsildən asılıdır.

Ən yaxşı təhsil sisteminə malik olan ölkələr ilk növbədə müəllimlərin seçilməsi, hazırlanması və əməyinin keyfiyyətini yüksəltməklə təhsilin inkişafında mühüm irəliləyişlər əldə etmişlər. Dünyanın bir çox məşhur pedaqoqlarının fikrincə, təhsilin keyfiyyətinə və tələbələrin təhsil səviyyəsinə birbaşa təsir göstərən məhz bu amildir. Məşhur təhsil ekspertləri M.Barber və M.Murşedin qeyd edildiyi kimi, “təhsil sisteminin keyfiyyəti orada çalışan müəllimlərin keyfiyyətindən asılıdır” (Barber, Murshed, 2008: 17).

Deməli, təhsilin keyfiyyətinin yüksəldilməsində müəllim heyətinin həlledici rolunu nəzərə alaraq müəllimlik üçün müraciət edənlərin ciddi şəkildə seçilməsi, müəllim heyətinin qiymətləndirilməsi üçün effektiv prosedurların işlənib hazırlanması, məktəbdə pedaqoji işə meyl və qabiliyyət nümayiş etdirən şagirdlərin aşkar edilməsinə yönəldilmiş peşəyönümü işinin aparılması hələ də çox vacib məsələ olaraq qalır.

Müəllimlik ixtisasına uyğun namizədlər müəllim hazırlığı proqramı ilə təhsilə başlamazdan əvvəl seçilməlidir. Danılmaz faktdır ki, ixtisas seçimində az bal toplayan çoxsaylı abituriyentlər müəllimliyə üz tuturlar. Bu da arzuladığımız keyfiyyətli təhsilin qarşısına əvvəldən xətt çəkməkdir. M.Barber və M.Murşedin haqlı olaraq qeyd etdiyi kimi ”...İstehsal həddən artıq çox olduğundan məzunların bir çoxu müəllim kimi işə düzələ bilmir ki, bu da ən bacarıqlı namizədlər üçün pedaqoji təhsilin cəlbediciliyini azaldır. Belə şəraitdə seçimi çox olmayanlar müəllimlik peşəsinə, məktəbi çox yaxşı qiymətlərlə bitirənlər isə daha rəqabətli ixtisaslara üstünlük verirlər” (Barber, Murshed, 2008: 21).

Pedaqoji kadrlarının hazırlanmasının birinci mərhələsində bu məsələni həll etmək olar. Ümumtəhsil məktəblərinin daha yaxşı göstəriciləri olan yuxarı sinif şagirdlərini pedaqoji profilli peşəyə yönəltmək üçün onların arasından müəllimliyə marağı olan şagirdləri üzə çıxarmaq lazımdır. Bu şagirdləri gələcək peşələrinin xüsusiyyətləri ilə tanış etmək məqsədi ilə pedaqoji kadr hazırlayan müəssisə tərəfindən xüsusi məlumatlandırıcı və motivasiyaedici seminarlar keçirilməlidir. Bu yanaşma təhsilalanlara həm gələcək peşələri ilə tanış olmağa, həm də bunun onlara uyğun olub-olmadığını, gözləntilərinin müasir müəllimlərin qarşısında qoyulan tələblərə cavab verib-vermədiyini anlamağa kömək edər, gələcək peşə seçiminə şüurlu yanaşmağa imkan verər.

İkinci mərhələdə isə onlar artıq peşə təhsilinə başlayırlar. Burada tələbələr üçün əsasən proqramlar üzrə təşkil olunmuş təlim keçirilir. Sürətli inkişaf edən qabaqcıl dünya təcrübəsini öyrədən təlimlərin tətbiqində isə gecikirik.

Pedaqoji kadrların müasir peşə hazırlığının vəzifələri aşağıdakılardır:

- təhsilinin keyfiyyətinin yüksəldilməsi;
- yeni peşəkar təhsil standartlarının tətbiqinə imkan verəcək müəllim hazırlığı proqramlarının və tədris texnologiyalarının məzmununun dəyişdirilməsi;
- müəllim heyətinin praktiki hazırlığının *təkmilləşdirilməsi*;
- pedaqoji təhsildə mütəxəssis hazırlığında fasiləsizliyin təmin edilməsi.

Təhsilin keyfiyyəti bir çox amillərdən asılıdır, lakin ən əsası müəllimlərin peşəkarlığıdır. "İnnovasiyanın yaradıcılıq və təcrübə ilə əlaqəli olduğunu" (Brewer, Tierney, 2012: 15) qəbul etmək çox vacibdir. Peşəkarlıq pedaqoji prosesin yüksək səviyyədə təşkili və aparılması, keyfiyyətli nəticələr əldə edilməsi üçün əsasdır. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyasında müəllimin peşə səriştəliliyinə xüsusi diqqət verilməsi də onun bu funksiyasından irəli gəlir (Azərbaycan Respublikasında təhsil üzrə Dövlət Strategiyası, 2013).

Peşəkar müəllimlər hazırlamaq istəyiriksə, müasir dərsin qurulmasında və keçirilməsində əsas diqqət gələcək müəllimlərin müstəqil idrak fəaliyyətinin təşkilinə yönəldilməlidir. Tələbələrin idrak fəaliyyətini artırmaq üçün psixoloji və pedaqoji şərtlər aşağıdakılardır:

1. Müəllimin biliyin ötürücüsü deyil, tələbələrin idrak fəaliyyəti üçün bələdçi olması, tədris məlumatının müəllim tərəfindən ümumiləşdirilməsi, onun sistemləşdirilməsi və strukturlaşdırılması;
2. Tələbələrin passiv dinləyicilərdən tədris prosesinin aktiv iştirakçısına çevrilməsi, müəyyən fəaliyyət sahəsinə meyllərinə uyğun idrak fəaliyyəti üçün motivasiyanın olması.
3. Aktiv metodların və kompüter təlim texnologiyalarının tətbiqi.

Qeyd etmək lazımdır ki, müəllimin və tələbələrin funksiyalarında dəyişiklik o zaman mümkündür ki, müəllim tələbələrin fəal müstəqil idrak fəaliyyətini təmin edən idarəetmə sistemi tətbiq edir, tədqiqat, yaradıcılıq tələb edən didaktik vasitələr hazırlayır, onların tədris prosesində həyata keçirilməsi üçün müxtəlif metodlar tətbiq edir. Professor M. İlyasov qeyd edir: "Müəllimin təşkilatçılıq fəaliyyəti onun pedaqoji fəaliyyəti ilə psixoloji təsirinin birliyindən yaranaraq formalaşır və bu, pedaqoji prosesin səmərə və keyfiyyətinin yüksəldilməsinə istiqamətlənir" (İlyasov, 2018: 126).

Bununla belə, təlim prosesində tələbələrin potensialını, yaradıcılıq imkanlarını reallaşdırmaq həmişə mümkün olmur. Bu baxımdan, kolleclərdə təhsil prosesinin bütün iştirakçılarının intellektual və yaradıcı potensialının inkişafına və möhkəmləndirilməsinə töhfə verən çoxşaxəli yaradıcılıq mərkəzlərinin yaradılmasına ehtiyac var. Belə bir mərkəzin əsas vəzifəsi tələbələrin peşə və yaradıcılıq qabiliyyətlərinin inkişafına şərait yaratmaq, onları bazar iqtisadiyyatı şəraitində rəqabətədavamlı hala gətirmək, mədəniyyətinin formalaşdırılmasıdır. Bu mərkəzdə müxtəlif seminarlar, treninqlər, sağlamlıq təlimləri vasitəsilə gələcək mütəxəssislərin fənn və fənlərarası sahələrdə, estetik yaradıcılıqda, sağlamlıq mədəniyyətinin (fiziki, əqli, mənəvi) formalaşmasında, kompüter qrafikasından istifadə edərək modelləşdirmədə, dizaynda yaradıcı qabiliyyətləri inkişaf edir.

İnformasiya texnologiyalarının sürətli inkişafı dövründə əsas diqqət ayrı-ayrı sahələrdən fərdi bilik, bacarıqların əldə edilməsinə deyil, keyfiyyətli nəticəsi olan təlimin formalaşdırılmasına yönəldilir. Məktəblərdə keyfiyyətli tədrisi təmin etmık üçün gələcək müəllimlərin metodik hazırlığı məsələsi diqqət mərkəzində saxlanılmalıdır. Müasir məktəb kurikulumu ilə tanışlıq, bu proqramda onlara çətin gələn məsələlərin səbəblərini başa düşmək, fənnin məktəb kursunun nəzəri əsaslarını bilmək, tədris metodlarına sahib olmaq, bu metodlarından yerində istifadə etmək bacarığı və s. əsas tələblərdəndir. Metodik cəhətdən hazırlanmış mütəxəssis, məktəbin tədris-metodiki kompleksinə əsaslı tənqidi qiymət verməyi, çoxsaylı alternativ dərsliklər, tədris vəsaitləri arasından seçim etməyi bacarmalı, müasir dərsliklərin məzmununa olan tələbləri bilməlidir.

Gələcək müəllimin metodik hazırlığı pedaqoji innovasiya vasitələrindən sistemli istifadəni də nəzərdə tutmalıdır. Bunun üçün cəmiyyət üzvünün innovativ dəyişikliklərə, yeni hesab etdiyimiz

bəzi texnologiyaların ən müasir texnologiyalarla əvəzlənməsinə hazır olmasını təmin edəcək müvafiq inkişaf strategiyası tələb olunur. Ona görə də "müəllimlərə yaxşı öyrətmək öyrədilməlidir" (Marcus, 2012). Müasir müəllim öz sahəsi üzrə kompüterin imkanlarını bilməli, multimediada tələbələrin fəaliyyətini idarə etmək bacarığına malik olmalı, nəhəng bir axın içərisindən lazımi məlumatları seçib sistemləşdirməyi bacarmalıdır. Bu zaman arzuladığımız keyfiyyətli təlimdən danışa bilərik.

Bu gün istənilən peşə insandan yüksək mənəvi-əxlaqi standartlara, davranış qaydalarına riayət etmək tələb edilir. Finlandiyalı pedaqoq Pasi Sahlberqin qeyd etdiyi kimi, "Biz yeni təhsil mədəniyyəti yaradırıq və geriyə yol yoxdur" (Sahlberg, 2011: 2). Ona görə də tələbələrimizin insanlara, cəmiyyətə, təbiətə münasibətdə mənəvi, əxlaqi keyfiyyətlərinin formalaşmasına kömək edən mexanizmlərin təmin edilməsi zəruridir. Pedaqoji kadr hazırlayan müəssisədə şəxsi komponent üstünlük təşkil etməlidir. Professor Ə.Ə.Əlizadə yazır: "Şagirdlər müəllimin erudisiyasını yüksək qiymətləndirirlər. Bilikli müəllimi sayırlar. Ancaq onlar səmimi, xeyirxah, qılıqlı, həssas, qəlbini uşaqlara verən və onlarla söhbət etməyi bacaran, hətta sinifdənkənar vaxtlarda da onlarla həvəslə məşğul olan müəllimi sevirlər" (Əlizadə, 1998: 223).

Belə keyfiyyətlərə yiyələnmələri üçün tələbələrin "Pedaqoji etika", "Konfliktologiya" kimi fənləri də öyrənmələri məqsədəuyğundur.

Pedaqoji kadrların davamlı hazırlanması problemi cəmiyyətin müasir inkişafı üçün böyük əhəmiyyət kəsb edir. Pedaqoji təhsildə mütəxəssis hazırlığında fasiləsizliyin təmin edilməsi ölkə başçısı İlham Əliyevin müəyyən etdiyi "Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər"də öz əksini tapan əsas istiqamətlərdən biridir: "Pedaqoji kadrların müasir hazırlığı davamlı təhsildir. Dünyada artan rəqabətə davam gətirə bilmək üçün iqtisadiyyatın uzunmüddətli inkişafı müasir və güclü təhsilə arxalanmalıdır. Məhz təhsil vasitəsilə insan kapitalının milli sərvətdə iştirak payı davamlı şəkildə artırılmalıdır.

...Cəmiyyətin inkişafının təminatçısı olan ümumi təhsilin gücləndirilməsi üçün təhsil sistemində gedən modernləşmə davam etdirilməli, məzmun islahatları dərinləşməli, inteqrativ tədris təcrübəsi inkişaf etdirilməlidir" ("Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər", 2021).

Hazırda kollecləri ləğv etmək və bütün gələcək müəllimlərdən yalnız ali təhsil tələb etmək mümkün deyil. Bundan əlavə, kolleclər təhsil müəssisələri üçün müəllimlərin hazırlanmasında böyük iş görürlər. Belə şəraitdə pedaqoji kadrların peşəkar hazırlığına tələblər də artır. Orta ixtisas təhsili müəssisələrində müəllim hazırlığının keyfiyyətinin yüksəldilməsi bu prosesin səmərəli idarə olunmasını tələb edir. Yaranmış təşkilati formaların və idarəetmə üsullarının yeni şəraitə, yeni vəzifələrə uyğun dəyişdirilməsi vacibdir. "Təkcə məktəbin effektiv idarə edilməsi yox, həm də inkişaf dinamikasının təmin edilməsi, müəllimin fəaliyyətinin dəyərləndirilməsi, təhsilin və təlimin idarə edilməsi keyfiyyətin yüksəldilməsinə xidmət edir" (Veysova, 2018: 28).

Effektiv təhsil sistemlərində tədrisin keyfiyyətinin yüksəldilməsinə bir sıra tədbirlər vasitəsilə nail olunur: təcrübəli müəllimlərin yeni başlayanlara peşəkar bacarıqlara yiyələnməsinə köməklik etdiyi mentorluq, müəllimlərin inkişafına yardım edən güclü məktəb rəhbərlərliyi, milli təhsil və tərbiyə sisteminin keyfiyyətinin yüksəldilməsinə yönəlmiş konstruktiv təkliflər "həlledici əhəmiyyət kəsb edən amilləri müəyyən etmək və ən səmərəli inkişaf strategiyalarını hazırlamaq" (Barber, Murshed, 2007: 17).

Pedaqoji kollecdə müəllim hazırlığı prosesinin idarə edilməsi, məzunların peşə və ümumi mədəni hazırlığı səviyyəsinin yüksəldilməsi, sabit təhsili təmin edən məktəb idarəçiliyinin təşkilati strukturunun təkmilləşdirilməsi bu günün tələbidir.

Pedaqoji kadrların hazırlanmasında müasir tendensiyalara riayət olunması böyük əhəmiyyət kəsb edir. Yalnız zamanla ayaqlaşmaqla peşənin nüfuzunu, müəllimin rolunun təhsilalanların həyatında əhəmiyyətini artırmaq olar.

## Nəticə

Təhsil sahəsində innovativ dəyişikliklər kontekstində mütəxəssislərin hazırlanması strategiyası dəyişir. Qarşıya qoyulan vəzifələrin həyata keçirilməsi üçün layiqli şərait yaratmadan təhsilin keyfiyyətindən danışmaq mümkün deyil. Maddi-texniki bazanın müasirləşdirilməsi və pedaqoji ixtisaslar üzrə tələbələrin tədrisinə yeni yanaşmalar peşəkar təcrübənin formalaşmasına imkan verəcək, pedaqoji işçilərin hazırlanması və ixtisas səviyyəsinin yüksəldilməsi problemlərini uğurla həll edəcəkdir. Tələbələrimiz pedaqogika sahəsində illər ərzində inkişaf etmiş ən yaxşı təcrübəni götürmək və onu müasir metodlar, təşəbbüskarlıq və fəal həyat mövqeyi ilə daha da inkişaf etdirmək üçün unikal imkana malikdirlər.

## Ədəbiyyat

1. Azərbaycan Respublikasının “Təhsil haqqında” qanunu. (2012). Bakı Çap evi, 64 s.
2. Əliyev, H. (2002).Təhsil millətin gələcəyidir (Tərtib edənlər: M.Mərdanov, Ə.Quliyev). Bakı: Təhsil, 580 s.
3. Barber, M., Murshed, M. (2008). Kak dobitsya stabilno vysokogo kachestva obucheniya v shkolakh. Uroki, analiz luchshikh sistem shkolnogo obrazovaniya mira. MakKinsi, 59 s.
4. Brewer, D. and Tierney, W. (2012). “Barriers to innovation in the US education”. Cambridge: Harvard Education Press, MA, pp.11-40.
5. Azərbaycan Respublikasında təhsil üzrə Dövlət Strategiyası. (2013). https://e-qanun.az/framework/27274
6. İlyasov, M. (2018). Müəllim peşəkarlığı və pedaqoji səriştəliliyin müasir problemləri. Monoqrafiya. Bakı: Elm və təhsil, 208 s.
7. Marcus, J. (2012). “Old school: four-hundred years of resistance to change” Harvard Education Press, Cambridge, MA, pp. 41-72.
8. Sahlberg, P. (2011). Finnish Lessons: What Can the World Learn from Educational Change in Finland, Teachers College, Columbia University, New York, NY.
9. Əlizadə, Ə. (1998). Müasir Azərbaycan məktəbinin psixoloji problemləri. Bakı: Ozan, 345 s.
10. “Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər”. (2021). https://president.az/az/articles/view/50474.
11. Veysova, Z. (2018). Məktəb əsaslı dəstəkləyici rəhbərlik modeli. Müəllimlər üçün vəsait. Bakı: Ecoprint.
12. Barber, M., Mourshed, M. (2007). Consistently high performance: lessons from the world′s top performing school systems. McKinsey and Company.

**Rəyçi: p.e.d. Piralı Əliyev**

Göndərildi: 14.12.2022 Qəbul edildi: 09.02.2023

DOI: https://doi.org/10.36719/2663-4619/88/46-51

**Sama Ahmadova**
Baku State University
master student
ehmedovasema2022@gmail.com

# THE ETHICS OF PERSONAL DATA COLLECTION AND USE

## Abstract

In the digital age, personal information is collected and used in a variety of ways. With the growth of social media, the rise of e-commerce users, and the expansion of the use of Internet of Things (IoT) technology, more personal data is being stored and shared online. Although this data is quite necessary and important for businesses and organizations, it raises ethical concerns about confidentiality, consent and transparency when processing personal data. In this article, the current practice is analyzed based on international and local legislation, the ethics of collecting and using personal data is examined, and the impact of this trend on individuals and society as a whole is considered.

***Keywords:*** *personal data, collection of personal information, data protection, use of personal information, ethics, privacy, consent, transparency*

**Səma Əhmədova**
Bakı Dövlət Universiteti
magistrant
ehmedovasema2022@gmail.com

## Fərdi məlumatların toplanması və istifadəsi etikası

## Xülasə

Rəqəmsal əsrdə fərdi məlumatlar müxtəlif yollarla toplanır və istifadə olunur. Sosial medianın inkişafı, elektron ticarətin istifadəçilərinin artması və Əşyaların İnterneti (IoT) texnologiyasından istifadənin genişlənməsi ilə fərdi məlumatlar daha çox onlayn olaraq saxlanılır və paylaşılır. Bu məlumatlar biznes və təşkilatlar üçün kifayət qədər lazımlı və vacib olsa da, fərdi məlumatların işlənilməsi zamanı konfidensiallıq, razılıq və şəffaflıqla bağlı etik narahatlıqları artırır. Bu məqalədə beynəlxalq və yerli qanunvericilik əsasında mövcud praktika təhlil olunaraq fərdi məlumatların toplanması və istifadəsi etikası araşdırılmış, bu tendensiyanın fərdlərə və bütövlükdə cəmiyyətə təsiri nəzərdən keçirilmişdir.

***Açar sözlər:*** *fərdi məlumatlar, fərdi məlumatların toplanması, fərdi məlumatların mühafizəsi, fərdi məlumatların istifadəsi, etika, məxfilik, razılıq, şəffaflıq*

## Introduction

Recent years have seen a significant increase in the collection of personal data by governments, businesses, and other organizations. This trend is driven by a number of factors, including the rise of digital technologies, the growing importance of data-driven decision-making, and the growing demand for personalized services and experiences. Also, with the development of social media, e-commerce, and the Internet of Things (IoT), more and more personal information is stored and shared online. Before we get into the ethics of collecting and using personal data, let's define what we mean by personal data. Personal data is any information that relates to an identified or identifiable living individual (7). This can include things like a person's name, address, date of birth, social security number, email address, phone number, and even IP address. It may also contain more sensitive information, such as a person's health records, financial information, and browsing history.

The collection and use of personal information can help businesses improve their marketing efforts, increase sales, and improve the customer experience. For individuals, personal information can provide access to personalized services and recommendations and help facilitate everyday tasks such as online shopping or banking (9). Despite the benefits of collecting and using personal data, there are also significant risks and concerns. One of the biggest risks is that personal data can be used for nefarious purposes such as identity theft, fraud, or cyberattacks. It can also be sold or shared without the individual's knowledge or consent, leading to a loss of privacy and control over personal information (8). Given the risks and concerns we have listed, it is important to consider the ethical implications of this trend. This highlights the importance of the ethics of collecting and using personal data and the need to study the impact of this trend on individuals and society as a whole.

**Importance of Informed Consent in Personal Data Collection and Use -** Informed consent is a crucial ethical factor to take into account while collecting and using personal data. Before collecting and processing personal data, businesses must get informed consent from people in many countries, according to laws and regulations. The General Data Protection Regulation (GDPR), a rule of the European Union that controls the gathering and processing of personal data, is one famous instance. Before collecting and using an individual's personal data, businesses must seek that person's express and specific consent under GDPR (7). By giving their consent, people may be sure that they are fully informed about how their data will be used and can decide for themselves whether or not to disclose it.

According to Article 8 of the Law of the Republic of Azerbaijan "On Personal Information", the collection and processing of personal information about any person is allowed only on the basis of written consent given by the subject. Written consent means consent in the form of an electronic document with an enhanced electronic signature or information provided in writing by oneself (1). In order to obtain consent, it is essential to inform people in a clear and simple manner about the reason for data collection, the legal basis for processing, and the duration of data retention. No matter their degree of technical expertise or education, everyone should be able to understand this information if it is presented in an approachable way. When collecting sensitive personal data, such as that pertaining to a person's health, ethnicity, religion, or sexual orientation, informed consent is especially crucial (10). People in these situations must expressly consent to the collection and processing of their data after being fully informed about how it will be used.

A key component of legislation and regulations governing data privacy is informed consent. Entities that fail to obtain individuals' informed consent may be subject to fines and other legal repercussions, including legal culpability. To guarantee that personal data is acquired and utilized in a legal and ethical manner, it is crucial that businesses prioritize informed consent as a core part of their data privacy practices. The 2017 Equifax data breach is yet another illustration of the significance of informed consent in the acquisition and use of personal information. Equifax, one of the largest credit reporting companies in the United States, suffered a major data breach in 2017 that compromised the personal information of more than 143 million people (6). Names, birthdates, Social Security numbers, addresses, and, in certain cases, driver's license numbers were among the data stolen. A breach in Equifax's website software led to the breach, which gave hackers access to the personal data of millions of people. Equifax obtained personal information without the clear and express consent of the interested parties. Those whose personal information was taken lacked control over it as well as a way to reject Equifax's data acquisition methods (12). The incident made clear the necessity for stricter laws governing data privacy. Equifax updated its data privacy policies in reaction to the incident and modified its data gathering procedures to make sure users are fully informed of how their data is being handled.

In conclusion, incidents like this serve as yet another reminder of the significance of ethical issues in the gathering and use of personal information. This emphasizes the significance of gaining individuals' informed consent and guaranteeing control over their personal information. To maintain

ethical data privacy policies and responsible and open gathering and use of personal information, organizations should emphasize these procedures.

**Transparency in Personal Data Collection and Processing: An Ethical Imperative -** As an ethical requirement, transparency in the gathering and processing of personal data has become more commonly recognized. Everyone has a right to information about the data that is gathered about them, how it is used, and who gets to see it. Companies gain customers' trust and show their dedication to proper data management when they are open and honest about how they gather and use client data. Individuals must be given clear and explicit information about how their data is gathered, processed, and used in order for data collection and processing to be transparent. The owner or operator shall expressly identify the purpose for collecting and using personal data, as required by Article 9.1 of the Law of the Republic of Azerbaijan on "Protection of Personal Data" (1).

In addition to doing this, information must be provided regarding the categories of data gathered, the uses to which the data is put, and the names of any third parties with whom the data is shared. Also, entities must give people clear explanations of their terms of service and privacy policies.

Transparency in data collection and processing is an ethical imperative because it helps users make informed decisions about their personal information. Individuals are better able to exercise their rights to access, modify, and delete their data when they are fully informed about how their data is being used.

Transparency also encourages accountability for companies that manage personal data and helps avoid the misuse of that data. Otherwise, privacy issues and data breaches can occur. An example is the Cambridge Analytica scandal, which involved the unauthorized collection and use of Facebook user data to influence political campaigns (5). The controversy emphasized the need for more openness in data gathering and processing procedures and increased public awareness of the significance of data privacy.

In conclusion, transparency in the gathering and use of personal data is a legal necessity that encourages accountability, motivates people, and develops trust. Companies that place a substantial priority on transparency in their data management procedures show their dedication to ethical data management and forge closer connections with customers.

**Security and Confidentiality of Personal Data: Ethical Considerations for Organizations -** The security and privacy of personal data are important issues for organizations that collect and process such data. Organizations are ethically obligated to maintain the security and confidentiality of the data they gather, in addition to the legal responsibilities for doing so. Therefore, it is necessary to look into the ethical issues surrounding the security and privacy of personal data. The Republic of Azerbaijan's Cabinet of Ministers determined that when processing personal data in information systems, fundamental organizational and technological security standards must be followed (2).

*Ethical considerations for the security of personal data* − Entities have a responsibility to make sure that personal data is secured from theft, loss, and unauthorized access. It is ethically required to preserve people's privacy and to take precautions against any potential harm that might result from unauthorized access to personal information. Basic technical and organizational safety requirements must be met in order to protect the security of personal data held by organizations, including the timely detection and prevention of facts indicating illegal interference, the possibility of immediately recovering changed or destroyed personal data, constant monitoring of the level of protection, the use of licensed software, the maintenance of an appropriate accounting system, etc. (2).

*Ethical considerations regarding privacy of personal information* − Secondly, organizations have a responsibility to guarantee that confidential data is protected and that only people with permission can access it. This commitment results from a moral duty to protect people's privacy and avoid potential harm from illegal access to personal information. Companies must set up the

necessary rules and procedures to guarantee that only authorized individuals can access personal information and that it is only used for the purposes for which it was gathered (7).

In general, the procedures to be followed to maintain the security and privacy of personal data can be separated into three stages:

- Data discovery: Companies need to learn what data sets exist in their systems, determine which are business vital, and determine which contain sensitive data subject to compliance rules.
- Deployment of numerous methods for data protection, including data loss prevention, internal data protection for storage, backups, snapshots, replication, firewalls, authentication and authorization, encryption, endpoint security, data deletion, and disaster recovery.
- Adherence to relevant legislation, such as GDPR, which may call for the deletion of superfluous data to reduce liability, must be ensured by organizations (4).

In practice, there are numerous cases related to violations of the security and privacy of personal data, one of which is the case of Szabo and Vissi v. Hungary, brought before the European Court of Human Rights (ECtHR).

The applicants in this case were two journalists investigating the use of surveillance technologies by the Hungarian government.

They discovered evidence that the government was using a powerful spyware program called Pegasus and published an article about it, but soon after, their own phones were infected with the same spyware. As a result of their investigations and reports, the journalists applied to the court, believing that their phones were infected with a virus and that their privacy and freedom of expression were violated. The ECtHR considered the Hungarian government's access to the personal data of the applicants through the use of spyware as an interference with the right to respect for private life (11).

This case demonstrates the importance of personal data security and privacy, especially in the context of government surveillance. The ECtHR decision recognized the importance of protecting the privacy of individuals, including journalists and human rights defenders, and confirmed the need for strong legal protection of personal data to protect individual rights and freedoms.

**Accountability and Penalties for Non-Compliance: Ensuring Ethical Use of Personal Data** – In recent years, there has been increasing attention to the importance of liability and penalties for non-compliance with data protection regulations to ensure the ethical use of personal data. Organizations that collect and process personal data must be held accountable for their actions and penalized if they fail to comply with relevant laws and regulations.

One of the main examples of this is the European Union's General Data Protection Regulation (GDPR), which includes the obligation to provide transparent information about data processing activities and the requirement to implement appropriate security measures to protect personal data. Organizations that violate these responsibilities may be subject to severe penalties under the GDPR, including fines of up to 4% of their annual global revenue or €20 million, whichever is higher. These fines are meant to discourage non-compliance and motivate enterprises to take their GDPR commitments seriously (7). A fine between three hundred and five hundred manats is imposed for violating the law, according to Article 375 of the Republic of Azerbaijan's Code of Administrative Offenses (3).

The above-mentioned Facebook and Cambridge Analytica cases represent an important illustration of the significance of accountability and the imposition of sanctions for non-compliance. As a response to Facebook's failure to protect user data, the US Federal Trade Commission fined the company $5 billion (5).

This case demonstrates the value of holding companies accountable for their activities and the necessity of stiff sanctions for violations of data protection laws. By imposing sanctions on companies that break these rules, governments and authorities can assure the moral and responsible gathering and processing of personal data while protecting individuals' rights.

## Conclusion

The investigation of ethical considerations related to the collection and use of personal data, the research conducted to determine the range of problems in this field, including the analysis of international and local legislation in this regard, have created the conditions for obtaining the following results.

- When processing personal data, organizations should have clearly stated policies and processes for the gathering and use of personal data. These policies and procedures should be made public and updated frequently as new regulations are introduced.
- Security measures should be improved, ensuring secure data gathering and storage with the use of firewalls and proper encryption.
- Before collecting and using a person's personal information, entities must have that person's explicit consent. This consent must be freely granted, relevant to the data's intended use, and informed.
- Governments should keep on making and implementing better privacy regulations that safeguard people from unethical uses of their personal information and promote a culture of ethical data use.

## References

1. General Data Protection Regulation. (2016). Regulation (EU) 2016/679 of the European Parliament and of the Council of 27 April 2016 on the protection of natural persons with regard to the processing of personal data and on the free movement of such data, and repealing Directive 95/46/EC. Official Journal of the European Union, L 119/1.
2. Max Freedman. (2023, January 23). How Businesses Are Collecting Data (And What They’re Doing With It). Business News Daily. https://www.businessnewsdaily.com/10625-businesses-collecting-data.html
3. GLS Law. (2021, November 24). What are the risks associated with collecting personal data? https://www.gls-startuplaw.com/blog/entry/what-are-the-risks-associated-with-collecting-personal-data
4. “Fərdi məlumatlar haqqında” Azərbaycan Respublikasının Qanunu. (2022). 11 may 2010-cu ildə qəbul edilmişdir (23 dekabr 2022-ci il tarixdə olan dəyişiklik və əlavələrlə). Bakı: “Azərbaycan” qəzeti, 31 dekabr.
5. Office of the Privacy Commissioner of Canada. (2018). Guidelines for Obtaining Meaningful Consent. https://www.priv.gc.ca/en/privacy-topics/collecting-personal-information/consent/gl_omc_201805/
6. Federal Trade Commission. (2019, July 22). Equifax data breach settlement. https://www.ftc.gov/enforcement/refunds/equifax-data-breach-settlement
7. United States Government Accountability Office. (2018). Data Protection: Actions Taken by Equifax and Federal Agencies in Response to the 2017 Breach. https://www.gao.gov/products/gao-18-559
8. Confessore, N., Hakim, D., & Keller, M.R. (2018, April 4). How Trump Consultants Exploited the Facebook Data of Millions. The New York Times. https://www.nytimes.com/2018/04/04/us/politics/cambridge-analytica-scandal-fallout.html
9. “Fərdi məlumatların mühafizəsinə dair Tələblər”in təsdiq edilməsi haqqında Azərbaycan Respublikası Nazirlər Kabinetinin Qərarı. (2022). 6 sentyabr 2010-cu ildə qəbul edilmişdir (25 avqust 2022-ci il tarixdə olan dəyişiklik və əlavələrlə). Bakı: “Xalq” qəzeti, 2 sentyabr.
10. Cloudian. (2021). Data protection and privacy: 7 ways to protect user data. https://cloudian.com/guides/data-protection/data-protection-and-privacy-7-ways-to-protect-user-data/
11. Szabo and Vissi v. Hungary, Application nos. 37138/14 and 988/15, (European Court of Human Rights. Jan. 12, 2016).

DOI: https://doi.org/10.36719/2663-4619/88/52-56

**Aqşin Ağazadə**
Bakı Biznes Universiteti
magistrant
aqsinders@gmail.com

# AZƏRBAYCANDA MÜASİR BANK SİSTEMİNİN FORMALAŞMASI XÜSUSİYYƏTLƏRİ VƏ İNKİŞAF MEYİLLƏRİ

**Xülasə**

Məqalənin əsas məqsədi ölkədəki bank sektorunun 2015‒2017-ci il böhranından sonrakı mövcud vəziyyəti araşdırmaqdır. Bank sektorunun inkişafı probleminin aktuallığı ondan ibarətdir ki, banklar öz iqtisadi siyasətini həyata keçirərək bütün milli iqtisadiyyatın davamlı artımını təmin edə bilirlər. Məqalədə bank sektorun strukturu, aktiv, depozit, kredit qoyuluşlarının həcmi və problemli kreditlərin səviyyəsi təhlil edilmişdir. Bank hesabatları və elmi məqalələr vasitəsilə bank sektorunun mövcud vəziyyəti və problemlərinin təhlili aparılmışdır. Məqalənin əhəmiyyəti budur ki, banklar müasir dövrdə iqtisadiyyatın ana sütununu təşkil edir və ölkəmizdə bank sektorunun iqtisadiyyata olan təsiri araşdırılmışıdır. Tədqiqat zamanı məlum oldu ki, bank sektoru inkişaf tempində olmasına baxmayaraq, hələ də iqtisadi təhlükələrə məruz qalır və iqtisadiyyata təsiri azdır.

***Açar sözlər:*** *bank, iqtisadiyyat, aktiv, kredit, depozit, COVID-19, böhran, həcm, faiz*

**Agshin Aghazade**
Baku Business University
master student
aqsinders@gmail.com

## Features of the formation of the modern banking system in Azerbaijan and development trends

**Abstract**

The main goal of the article is to examine the current situation of the banking sector in the country after the crisis of 2015‒2017. The relevance of the problem of the development of the banking sector is that banks can ensure the continuous growth of the entire national economy by implementing their economic policy. The structure of the banking sector, the volume of assets, deposits, credit investments and the level of problematic loans are analyzed in the article. Analysis of the current situation and problems of the banking sector was carried out through bank reports and scientific articles. The importance of the article is that banks are the main pillar of the economy in modern times, and the impact of the banking sector on the economy in our country has been investigated. The research has revealed over time that the banking sector is still exposed to economic threats and has little impact on the economy, despite its rapid development.

***Keywords****: bank, economy, assets, credit, deposit, COVID-19, crisis, volume, interest*

## Giriş

Azərbaycanda maliyyə sektoru daha çox kommersiya banklarından ibarətdir. Banklar maliyyə sektorunun ümumi aktivlərinin 90%-dən çoxuna sahibdirlər. Sığorta, birja və s. kimi digər maliyyə institutları kifayət qədər kiçikdir və maliyyə sektorunun sağlamlığına əhəmiyyətli təsir göstərmir.

2015-ci ildə Azərbaycanda bank sektoru ciddi böhran yaşamışdır. 2 il ərzində davam edən böhranın təsir nəticəsində bank sektorunda ciddi dəyişiklər olmuşdur. 2018 və 2019-ci illərdə yenidən inkişaf tempi yaşasa da, 2020-ci ildə Covid-19 virusu səbəbi ilə baş verən panmediya və neft qiymətlərin azalması ölkə iqtisadiyyatına təsir etdiyi qədər bank sektoruna da ciddi təsir etmişdir. Tədqiqat zamanı da bank sektorunun son illərdəki vəziyyəti haqqında bəhs ediləcək.

Banklar iqtisadiyyatın pul və kredit ehtiyacını ödəyən qurumlardır və iqtisadiyyatın inkişafında böyük rol oynayırlar (Abışlı, Məhərrəmov, Qarayev, Sarıyev, Tağıyev, 2019: 21). Beləliklə, sistem əhəmiyyətli banklar maliyyə bazarının infrastrukturunun gücləndirilməsi üçün böyük təsirə malikdir və səmərəli funksiyaları yerinə yetirirlər (Əliyev, 2019: 52).

**Cədvəl 1.**
**Bank bazarının strukturu və xidmət şəbəkəsi**

| Göstəricilər | 2015 | 2016 | 2017 | 2018 | 2019 | 2020 | 2021 | 2022 |
|---|---|---|---|---|---|---|---|---|
| Dövlət banklarının sayı | 2 | 2 | 2 | 2 | 2 | 2 | 2 | 2 |
| Özəl bankların sayı | 41 | 30 | 28 | 28 | 28 | 24 | 24 | 23 |
| Xarici kapitallı bankların sayı | 21 | 15 | 15 | 15 | 14 | 12 | 12 | 11 |
| Bankların filiallarının sayı | 750 | 569 | 509 | 508 | 509 | 455 | 479 | 487 |
| Bank sektorunda çalışan işçilərin sayı | m/y | 16947 | 16171 | 17415 | 19460 | 18708 | 20329 | 22777 |

*Cədvəl müəllif tərəfindən aba.az makromaliyyə hesabatlarına əsasən qurulub.*

2015−2017-ci il böhranı bank sisteminə ciddi təsir etmişdir. Belə ki, 2015-ci ildə bank sayı 45 olduğu halda, 2017-ci ildə sayları 30-a enmişdir. 2018 və 2019-cu illərdə bank sektoru inkişaf etməyə başladı. Cədvəl 1-dən göründüyü kimi, bank filial və işçi sayı artmışdı. Lakin 2020-ci ildə baş verən pandemiyanın iqtisadiyyata vurduğu zərbə bu sektordan da yan ötməmişdir. 2019-ci ilin sonunda Azərbaycanda 30 bank fəaliyyət göstərdiyi halda, 2023-cü ildən etibarən isə 25 bank fəaliyyətini davam etdirəcək.

Onlardan ikisi dövlət bankıdır. Xarici kapitallı bankların sayı isə 12 dir. Z.F.Məmmədov qeyd edir ki, xarici investorların ölkə banklarının mülkiyyət strukturu səviyyəsində iştirakı onların rəqabətqabiliyyətliliyinin artmasına, eləcə də liberallaşma kimi şəraitdə kapitallaşma imkanlarına birbaşa təsir göstərən ən mühüm amil hesab edilir (Mamedov, Valiyev, Veysov, 2020: 89-90). Xarici investorların sayının azalmasına şahid oluruq. 2015-ci ildə xarici kapitallı bank sayı 21 idisə, 2017-ci ildə 15-ə, 2022-ci ildə isə 12-yə qədər enmişdir. Bu da xarici investorların sektora inamının az olmasını və liberallaşma şəraitin zəif olduğunu göstərir. Elnur Sadiqov qeyd edir ki, Azərbaycanda bank sektorunun inkişafı beynəlxalq maliyyə təşkilatları ilə qarşılıqlı əlaqədə olmadan, dünya təcrübəsindən istifadə etmədən həyata keçirilə bilməz (Sadigov, 2013: 213). Buna görə də xarici kapitallı bankların azalması sektor üçün mənfi haldır.

Ümumiyyətlə, Azərbaycan iqtisadiyyatının ümumi xüsusiyyətləri onun xarici şoklara yüksək həssaslığını müəyyən edir ki, bu da təbii ki, bank sektoruna təsir göstərir (Valiyeva, 2020: 50). Pandemiya Azərbaycana digər ölkələrə nisbətən gec gəlib, lakin enerji qiymətlərinin ucuzlaşması fenomeni müşahidə olunmağa başlayıb. Azərbaycanda makroiqtisadi sabitliyin qorunmasında irəliləyiş və qlobal risklərin qarşısının alınması üçün qəbul edilən qərarlar Azərbaycan bazarı üçün qlobal volatilliyin artması risklərini məhdudlaşdırıb (Musayev, 2015: 53).

**Bank resursları: resursların mənşəyi və istifadəsi**

Bankların maliyyə sabitliyinin təhlilində mühüm əhəmiyyət kəsb edən digər göstəricilər, yəni bank sisteminin aktivləri, kreditləri, kapitalı və depozitləri ilə bağlı göstəricilər də cədvəl 2-də öz əksini tapmışdır.

**Cədvəl 2.**
**Bank sektorunun əsas göstəriciləri**

| Göstəricilər (mln. AZN) | 2015 | 2016 | 2017 | 2018 | 2019 | 2020 | 2021 | 2022 |
|---|---|---|---|---|---|---|---|---|
| Aktivlər | 34906.0 | 31439.5 | 27921.0 | 29502.4 | 32722.8 | 32055.3 | 38462,2 | 47054.9 |
| İqtisadiyyata cəmi kredit qoyuluşları | 21730.4 | 16444.6 | 11757.8 | 13020.3 | 15298.2 | 14530.4 | 17119,8 | 20184 |
| Vaxtı keçmiş kreditlər | 1508.5 | 1472.6 | 1626.7 | 1585.0 | 1273.1 | 893.1 | 719,4 | 593.7 |
| Bank sektorunun məcmu kredit portfeli | 21152.0 | 15971.2 | 11337.6 | 12628.3 | 14900.9 | 14157.0 | 16659,1 | 19594.4 |
| Cəmi depozitlər | 23431.4 | 22091.0 | 20599.1 | 21870.4 | 24746.0 | 23666.9 | 29027,7 | 36249.8 |

*Cədvəl müəllif tərəfindən aba.az makromaliyyə hesabatlarına əsasən qurulub.*

**Bank sektorunun məcmu kredit portfeli və depozit qoyuluşu**

2021 və 2022-ci ildə depozit həcmlərin 2015-ci ilə nəzərən yüksək olduğu müşahidə olunur. Ümumiyyətlə isə, 2020-ci il xaric depozit həcmlərin son illərdə artdığı müşahidə olunur. Bu da əhalinin banklara inamının artdığını göstərir. Lakin 2020-ci ildə baş verən iqtisadi durğunluğun nəticəsində əhalinin gəlirlərinin azalması, 4 bankın bağlanması, habelə pandemiyanın yaratdığı qeyri-müəyyənlik ilə əlaqədar olaraq depozit həcmləri azalmışdır. Lakin 2021-ci ildə iqtisadiyyatın yenidən canlanması depozit həcmlərin artmasına səbəb olmuşdur. Həmçinin 2022-ci ildə depozit həcmlərinin hədsiz dərəcədə artmasının digər səbəbi də, iqtisadiyyatda baş verən yüksək inflyasiya amilidir. Əhali pullarını inflyasiyadan qorumaq üçün banklara daha çox depozit ediblər. Depozitlərdə olan müsbət tendensiyanı, kredit portfeli üçün söyləmək olmur. Mövcud kredit portfelinin həcmi hələ də, 2015-ci ildəki göstəricidən aşağı həcmdədir. Lakin 2017-ci ildən etibarən kredit portfelinin həcminin artdığı müşahidə olunur.

**Aktivlərin və iqtisadiyyata cəmi kredit qoyuluşlarının həcmi**

2015-17-ci illər böhranı zamanı bankların aktivlərin və iqtisadiyyata cəmi kredit qoyuluşları həcmi ciddi şəkildə azalmışdır. Dövlət və Mərkəzi Bankın dəstəyi, iqtisadiyyatın yenidən inkişafı sayəsində 2018 və 2019-cu illərdə resursların həcmi artmışdır. 2020-ci ildə qeyd etdiyimiz səbəblər ucbatından yenidən azalma baş versə də, 2021-ci ildə neft qiytmətlərin artması və vaksin olunan insanların çoxluq təşkil etməsi iqtisadiyyatın inkişafına müsbət təsir etmişdir ki, bu da bankın resusrlarının həcmində özünü göstərmişdir. Xüsusilə də, aktivlərin həcmi rekord səviyyədə artmışdır. Lakin buna baxmayaraq, aktivlərin və iqtisadiyyata cəmi kredit qoyuluşlarının həcmi iqtisadiyyata nisbətən ölçüsü kiçikdir.




*Mənbə: aba.az makromaliyyə hesabatları*

Qrafik 1-də göründüyü kimi, 2022-ci il üçün bank sektorunun ümumi aktivlərinin ÜDM-ə nisbəti 35.2%, kredit qoyuluşun həcmi isə 15.1% təşkil edib. Son 2 ildə ÜDM-nin artması müşahidə olunsa, bu əmsalların da azaldığı müşahidə olunur. Bu da onu göstərir ki, bankların iqtisadiyyatına verdiyi faydanın həcmi azdır. "Qara Dəniz Ticarət və İnkişaf Bank"ının 2020-ci ildə Azərbaycan bank sektoru üzrə apardığı təhlil zamanı qeyd edib ki, üzv ölkələri və daha geniş region arasında ən aşağı göstərici Azərbaycana məxsusdur (Black Sea Trade and Developmeny Bank, 2020). Bu da ölkədə maliyyə nüfuzunun aşağı olmasından xəbər verir.

Hələlik beynəlxalq kontekstdə Azərbaycan bankları çox kiçikdir və hər biri ayrı-ayrılıqda çox əhəmiyyətsizdir. Sektorda yığım effektinin geniş miqyasda həyata keçirilməsinə imkan verməyən kiçik banklar həddən artıq çoxdur (Mamedov, Valiyev, Veysov, 2020: 132).

Azərbaycanda kommersiya banklarının maliyyə investorları kimi rolunu çox zəif səviyyəyə uyğun qiymətləndirmək olar. Belə mövqenin səbəbi maliyyə bazarının vəsaitlərin yenidən bölüşdürülməsi funksiyasının qeyri-səmərəliliyi ilə izah etmək olar (Kamilov, 2017: 74).

**Vaxtı keçmiş kreditlər**

Azərbaycanda bank sektorunun digər mühüm problemi yüksək bank faizləridir. Ölkədə bankların kredit faizinin yüksək olması əhali arasında narazılıq yaradır. Mövzunun dəfələrlə gündəmə çevrilməsinə və bir sıra addımlar atılmasına baxmayaraq, problem hələ də həllini tapmayıb. Kredit faizlərinin bu qədər yüksək olmasının səbəbi kommersiya banklarıdır. Əslində, banklar yüksək faizlə maraqlanmamalıdırlar, çünki gələcəkdə yüksək faiz dərəcələri kreditlərin ödənilməməsi riskini artıra və bank-müştəri münasibətlərini çətinləşdirə bilər (Valiyeva, 2021: 121-127).




*Mənbə: aba.az makromaliyyə hesabatları*

2014-cü ildə neftin qiymətinin düşməsi və bunun nəticəsində baş verən regional şok və iqtisadi böhrandan sonra bankların balansında vaxtı keçmiş kreditlər artmağa başlamışdı. Azərbaycan bank sektoru üçün ən böyük təhlükələrdən biri probemli kreditlərin həcmidir (11).

Qrafik 2-də qeyd edildiyi kimi, 2015-ci ildə 6.9% olduğu halda, 2017-ci ilin sonunda iqtisadiyyata qoyulmuş kreditlərin 13.8% çatmışdır. O vaxtdan bəri bank sektorundan edilən

dəyişikliklər və yenidən maliyyələşdirilməsindən sonra vaxtı keçmiş kreditlər azalıb və 2022-ci ildə isə ümumi kreditlərin 2.99%-ni təşkil edib. 2016-ci ildə qəbul edilmiş Strateji Yol Xəritəsində problemli kreditlərin həcminin 8%-ə qədər enməsi nəzərdə tutulmuşdur ki (Azərbaycan Respublikasında maliyyə xidmətlərinin inkişafına dair Strateji Yol Xəritəsi, 2016: 59), bu hədəfə də nail olunmuşdur.

**Nəticə**

2015-17 böhranından sonra bank sektoru inkişaf tempini yaşayır. Lakin mövcud təhlil zamanı göründü ki, bank sektorunda yenidən böhran yaşamaq təhlükəsi yüksəkdir. Ümumiyyətlə, Azərbaycan iqtisadiyyatının ümumi xüsusiyyətləri onun xarici şoklara yüksək həssaslığını müəyyən edir ki, bu da təbii ki, bank sektoruna təsir göstərir. Ölkə iqtisadiyyatı isə neft-qaz sektorunda aslı olduğu üçün, həmin sektorda qiymət artımı və azalması anında sektorda öz təsirini göstərir. Hələ də, maliyyə-bank sektoru üçün lazımi mühitin olmaması, bankların iqtisadiyyata təsirinin az olması müşahidə olunur. Müsbət tendensiyalar kimi maliyyə göstəricilərinin həcminin artması və vaxtı keçmiş kreditlərin həcmi göstərmək olar.

**Ədəbiyyat**

1. Abışlı, L.V., Məhərrəmov, A.M., Qarayev, F.M., Sarıyev, K.A., Tağıyev, M.R. (2019). Bank işi. Bakı, s.21.
2. Əliyev, V.Ə. (2019). Maliyyə bank mexanizmlərinin səmərəliliyinin artırılmasında sistem əhəmiyyətli bankların strateji əhəmiyyəti. Bakı: Audit, C. 25, № 3, s.52.
3. Mamedov, Z.F., Valiyev, E.N., Veysov, E.N. (2020). Sovremennyye osobennosti razvitiya bankovskogo sektora Azerbaydzhana. Ekonomicheskiye nauki. Moskva, № 7, s.132.
4. Sadigov, E.M. (2013). Osnovnyye napravleniya razvitiya bankovskoy sistemy Azerbaydzhana. Kiyev: Vísnik Yekonomíchnoї Nauki Ukraїni, № 1, s.213.
5. Valiyeva, Ye.F. (2020). Tekushchee sostoyanie i perspektivy razvitiya bankovskogo sektora strany. Baku: Audit, T. 2, № 1, s.50.
6. Musayev, S.I. (2015). Rol' bankovskogo kreditovaniya v razvitii real'nogo sektora ekonomiki Azerbaydzhana. Moskva: Azimut nauchnykh issledovaniy: ekonomika i upravleniye. Tom 13, № 4, s.53.
7. Overview of the financial sector in Azerbaijan. (2020). Black Sea Trade and Developmeny Bank – Thessaloniki. https://www.bstdb.org/
8. Mamedov, Z.F., Valiyev, E.N., Veysov, E.N. (2022). Assessment of the national banking sector in Azerbaijan: Formation and development. Research Result. Economic Research-Belgorod, Vol 8, No. 1, s.89-90.
9. Kamilov, A. (2017). Azərbaycanda bank kapitalının real sektorun maliyyələşdirlməsinə cəlb edilməsı yolları. Bakı: İpək Yolu, № 2, s.74.
10. Veliyeva, Y.F. (2021). Prospects for the development of the banking sector of Azerbaijan. Moscow: Finance. Theory and practice, Vol 25, No. 1, p.121-127.
11. Makromaliyyə hesabatlar. (2022). Bakı: ABA. https://aba.az/
12. Azərbaycan Respublikasında maliyyə xidmətlərinin inkişafına dair Strateji Yol Xəritəsi. (2016). 6 dekabr 2016-ci il tarixində qəbul edilmişdir. Bakı, 59 s.

**Rəyçi: i.e.d. Sərvər Abbasov**

Göndərildi: 15.11.2022 Qəbul edildi: 17.02.2023

DOI: https://doi.org/10.36719/2663-4619/88/57-61

**Nigar Abdullayeva**
Bakı Dövlət Universiteti
magistrant
abdullayevaaa.nigar@gmail.com

# ÇİRKLİ PULLARIN YUYULMASINA QARŞI MÜBARİZƏ – BEYNƏLXALQ ƏMƏKDAŞLIQ

**Xülasə**

Çirkli Pulların Yuyulmasına Qarşı Mübarizə (AML) şübhəli əməliyyatları fəal şəkildə izləmək və hesabat vermək üçün maliyyə institutlarının normativ uyğunluq tələblərinin bir hissəsi kimi görməli olduğu tədbirlərə istinad edir və cinayətkarların maliyyə cinayətlərinin və qeyri-qanuni fəaliyyətinin qarşısını almaq üçün siyasətləri, qanunları və qaydaları ehtiva edir. Maliyyə cinayətlərinin qarşısını almaq üçün bütün dünyada qlobal və yerli tənzimləyicilər yaradılır və bu tənzimləyicilər təlimatlar yaradır. Məqalədə çirkli pulların yuyulmasına qarşı mübarizə konsepsiyası, onun qısa tarixi inkişafı və beynəlxalq əməkdaşlığın əhəmiyyətindən bəhs edilir. Məqalədə çirkli pulların yuyulmasına qarşı mübarizənin səmərəliliyinin artırılması yolları göstərilir və bu sahədə qəbul edilmiş sənədlər nəzərdən keçirilir.

***Açar sözlər:*** *çirkli pulların yuylması, qanunvericilik, cinayət yolu ilə əldə edilmiş əmlak, beynəlxalq əməkdaşlıq, maliyyə, qarşılıqlı hüquqi yardım, qeyri-qanuni gəlir, bank, korrupsiya, narkotik vasitələrin qanunsuz dövriyyəsi*

**Nigar Abdullayeva**
Baku State University
master student
abdullayevaaa.nigar@gmail.com

## Anti-money-laundering – international cooperation

**Abstract**

Anti-Money Laundering (AML) refers to the measures that financial institutions are required to take as part of their regulatory compliance requirements to actively monitor and report suspicious transactions and includes policies, laws, and regulations to prevent criminals' financial crimes and illegal activity. Global and local regulators are established worldwide to prevent financial crimes, and these regulators build policies. The article discusses the concept of combating money laundering, its brief historical development and the importance of international cooperation. The article shows ways to increase effectiveness in the fight against money laundering and discusses the documents adopted in this area.

***Keywords:*** *money laundering, legislation, criminal property, international cooperation, finance, mutual legal assistance, illegal income, banking, corruption, drug trafficking*

## Giriş

Çirkli pulların yuyulması qeyri-qanuni yolla əldə edilmiş gəlirlərin (yəni "çirkli pullar"ın) qanuni (yəni "təmiz") görünməsi prosesidir. Tipik olaraq, bu, üç addımı əhatə edir: yerləşdirmə, təbəqələşmə və inteqrasiya. Birincisi, qeyri-qanuni vəsaitlər gizli şəkildə qanuni maliyyə sisteminə daxil edilir. Daha sonra, pul çaşqınlıq yaratmaq üçün, bəzən çoxlu hesablar vasitəsilə ötürülmə və ya köçürmə yolu ilə köçürülür. Nəhayət, "çirkli pul" "təmiz" görünənə qədər əlavə əməliyyatlar vasitəsilə maliyyə sisteminə inteqrasiya olunur. Çirkli pulların yuyulması narkotik ticarəti və terrorizm kimi cinayətləri asanlaşdıra və qlobal iqtisadiyyata mənfi təsir göstərə bilər. Çirkli

pulların yuyulmasına qarşı mübarizə qeyri-qanuni vəsaitləri qanuni gəlir kimi gizlətmək cəhdlərini aşkar etməyə yönəlmiş qanunlar, qaydalar və prosedurlar şəbəkəsinə istinad edir (Borlini, Leonardo, Montnaro, 2017). Çirkli pulların yuyulması kiçik müddətli vergidən yayınma və narkotik ticarətindən tutmuş ictimai korrupsiyaya və terror təşkilatları kimi tanınan qrupların maliyyələşdirilməsinə qədər olan cinayətləri gizlətməyə çalışır. PL/TMM qanunları maliyyə sahəsinin böyüməsində, beynəlxalq kapital nəzarətinin gücləndirilməsində və mürəkkəb maliyyə əməliyyatlarının aparılmasının asanlaşdırılmasında böyük rol oynayır.

“Maliyyə sistemini maliyyə cinayətlərinin, o cümlədən terrorizmin maliyyələşdirilməsi, çirkli pulların yuyulması və digər qeyri-qanuni fəaliyyətlərdən sui-istifadəsindən qorumaq” missiyasında Maliyyə Cinayətlərinə Qarşı Mübarizə Şəbəkəsi Bank Sirri haqqında Qanunun (Bank Secrecy Act) təyin edilmiş inzibatçısı kimi çıxış edir (2). BSA 1970-ci ildə yaradılıb və çirkli pulların yuyulmasına qarşı mübarizədə ən mühüm vasitələrdən birinə çevrilib. O vaxtdan bəri bir çox digər qanunlar hüquq-mühafizə və tənzimləyici qurumları çirkli pulların yuyulması ilə mübarizə üçün ən təsirli vasitələrlə təmin etmək üçün BSA-nı təkmilləşdirmiş və dəyişdirmişdir. 1970-ci ildən bəri çirkli pulların yuyulmasına qarşı qanunların müvafiq tələbləri və məqsədləri ilə indeksi xronoloji ardıcıllıqla aşağıda verilmişdir.

Bank Secrecy Act (1970); Money Laundering Control Act (1986); Anti-Drug Abuse Act of (1988); Annunzio-Wylie Anti-Money Laundering Act (1992); Money Laundering Suppression Act (1994); Money Laundering and Financial Crimes Strategy Act (1998); Uniting and Strengthening America by Providing Appropriate Tools Required to Intercept and Obstruct Terrorism Act of 2001 (USA PATRIOT Act); Intelligence Reform & Terrorism Prevention Act of 2004.

Çirkli Pulların Yuyulmasına Qarşı Mübarizənin (Anti Money Laundering) mənşəyi 20-ci əsrin əvvəllərində ABŞ-da mütəşəkkil cinayətkar qrupların öz cinayət əməllərindən əldə edilən gəlirləri gizlətmək üçün çirkli pulların yuyulması üsullarından istifadə etməyə başladığı vaxta təsadüf edir. 1920-ci illərdə qeyri-qanuni fəaliyyət nəticəsində əldə edilən pulların mənşəyinin gizlədilməsi praktikasını təsvir etmək üçün “yuyulma” termini istifadə edilmişdir. İlk müasir AML qaydaları 1970-ci illərdə artan narkotik ticarəti probleminə və cinayət təşkilatlarının maliyyə resurslarının kəsilməsi zərurətinə cavab olaraq ABŞ-da qəbul edilmişdir. 1970-ci il Bank Sirri Aktı (BSA) ABŞ-da maliyyə institutlarından 10.000 ABŞ dollarından çox pul əməliyyatlarının qeydlərini aparmağı və şübhəli fəaliyyət barədə səlahiyyətlilərə məlumat verməyi tələb edən ilk əsas AML qanunvericiliyi idi. 1980-ci illərdə çirkli pulların yuyulmasına qarşı qlobal mübarizə geniş vüsət aldı və çirkli pulların yuyulmasına qarşı mübarizədə beynəlxalq əməkdaşlığı təşviq etmək üçün G7 (The international Group of Seven- Böyük Yeddilik Dövlətləri) ölkələri qrupu tərəfindən Maliyyə Fəaliyyət İşçi Qrupu (FATF- The Financial Action Task Force) yaradıldı. FATF PL/TM-ə qarşı fəaliyyət üzrə beynəlxalq standartları müəyyən edir, bu standartların üzv ölkələr tərəfindən tətbiqini müstəqil surətdə qiymətləndirir və dövlətlər üçün icrası məcburi xarakter daşıyan qərarlar qəbul edir. FATF üzv ölkələr tərəfindən zəruri tədbirlərin görülməsi istiqamətində əldə edilən irəliləyişlərə nəzarət edir, PL/TMM sahəsində metodları nəzərdən keçirir, bütün dünyada müvafiq tədbirlərin qəbulu və tətbiqini təbliğ edir, PL/TM-ə qarşı mübarizədə iştirak edən digər beynəlxalq qurumlarla əməkdaşlıq edir. FATF 1990-cı ilin aprel ayında pulların leqallaşdırılmasına qarşı ətraflı fəaliyyət planı kimi çıxış edən, çirkli pulların yuyulması ilə mübarizə zamanı ölkələrin riayət etmələri üçün bir sıra tövsiyələr və təlimatlar adı altında 40 tövsiyəni özündə əks etdirən hesabat təqdim etmişdir. 1990-cı illərdə AML səylərinin diqqəti bütün dünyada bir sıra yüksək profilli terror hücumlarından sonra narkotik ticarətindən terrorizmin maliyyələşdirilməsinə keçdi. 2001-ci il ABŞ-ın PATRIOT Aktı terrorizmin maliyyələşdirilməsinə qarşı mübarizədə ABŞ-da AML qanun və qaydalarını gücləndirən mühüm mərhələ oldu. O vaxtdan bəri, AML qaydaları inkişaf etməyə və genişlənməyə davam etdi, Avropa İttifaqı 2005 və 2015-ci illərdə müvafiq olaraq 3-cü və 4-cü AML Direktivlərini və 2018-ci ildə çirkli pulların yuyulması və terrorizmin maliyyələşdirilməsi ilə mübarizə üçün əlavə tədbirlər təqdim edən 5-ci AML Direktivini qəbul etdi (3).

Bu gün FATF Çirkli pulların yuyulmasına qarşı mübarizə ilə bağlı beynəlxalq standartların müəyyən edilməsində və maliyyə cinayətlərinə qarşı mübarizədə qlobal əməkdaşlığın təşviqində

liderlik etməyə davam etməkdədir. Son 20 ildə bütün dünyada Çirkli Pulların Yuyulmasına Qarşı Mübarizə (AML) sistemləri hazırlanmışdır. AML sistemləri narkotik vasitələrin qanunsuz dövriyyəsi, fırıldaqçılıq və korrupsiya kimi müxtəlif predikat (əsas) cinayətlərdən əldə edilən gəlirlərin yuyulmasını azaltmaq məqsədi daşıyır. AML sistemləri1 qeyri-qanuni davranışın aşkarlanması, günahkarların cəzalandırılması və qeyri-qanuni aktivlərin geri alınması risklərini artırmaqla korrupsiyanın qarşısını ala bilər. Effektiv milli AML sistemləri korrupsiyanın səviyyəsinə və hallarına təsir etməli olsa da, korrupsiyaya qarşı mübarizə vasitəsi kimi AML-dən istifadənin tam potensialı hələ reallaşdırılmamışdır. Əhəmiyyətli problem korrupsiyalaşmış siyasi elitaların AML sistemlərini alt-üst edə bilməsidir.

Narkotik vasitələrin qanunsuz dövriyyəsi, qaçaqmalçılıq, insan alveri, korrupsiya və başqa oxşar cinayət fəaliyyətləri cinayət əməlini həyata keçirən şəxslər və ya qruplar üçün külli miqdarda gəlir əldə etməyə meyllidir. Bununla belə, cinayətkarlar bu cür qeyri-qanuni mənbələrdən əldə edilən vəsaitlərdən istifadə etməklə hakimiyyətin diqqətini əsas cinayət fəaliyyətinə cəlb etmək və cinayət təqibinə məruz qalmaq riski ilə üzləşirlər. Cinayət yolu ilə əldə etdikləri gəlirlərdən sərbəst şəkildə faydalanmaq üçün onlar bu vəsaitlərin qeyri-qanuni mənşəyini gizlətməlidirlər.

Qısaca təsvir edilən “çirkli pulların yuyulması” cinayət fəaliyyətindən əldə edilən gəlirlərin qeyri-qanuni mənşəyini gizlətmək üçün maskalanması prosesidir. Daha doğrusu, çirkli pulların yuyulmasına dair Vyana Konvensiyasına və Palermo Konvensiyasının müddəalarına əsasən, o, üç fərqli, alternativ “aktus reus” aspektini əhatə edə bilər: (i) bu cür əmlakın cinayətdən əldə edilən gəlir olduğunu bilərək, konvertasiya və ya köçürmə (ii) gizlədilmə və ya bu əmlakın cinayət yolu ilə əldə edilən gəlir olduğunu bilərək, əmlakın əsl mahiyyətini, mənbəyini, yerini, sərəncamını, hərəkətini və ya mülkiyyət hüququnu gizlətmək; və (iii) alındığı anda belə əmlakın cinayətdən əldə edilən gəlir olduğunu bilərək, əmlakın əldə edilməsi, ona sahiblik edilməsi və ya istifadəsi (4).

Çirkli pulların yuyulması cinayət yolu ilə əldə edilən gəlirlərin qeyri-qanuni mənşəyinin gizlədilməsi prosesidir. Terrorizmin maliyyələşdirilməsi terror məqsədləri üçün vəsaitlərin toplanması və ya təmin edilməsidir. Çirkli pulların yuyulması halında vəsaitlər həmişə qeyri-qanuni mənşəlidir, terrorçuluğun maliyyələşdirilməsində isə vəsait həm qanuni, həm də qeyri-qanuni mənbələrdən əldə edilə bilər. Buna görə də terrorizmin maliyyələşdirilməsində iştirak edən fiziki və ya qurumların əsas məqsədi pulun mənbələrini gizlətmək deyil, həm maliyyələşdirmə fəaliyyətini, həm də maliyyələşdirilən fəaliyyətin xarakterini gizlətməkdir. Oxşar üsullar həm çirkli pulların yuyulması, həm də terrorizmin maliyyələşdirilməsi üçün istifadə olunur. Hər iki halda fəaliyyəti həyata keçirən maliyyə sektorundan qeyri-qanuni istifadə edir. Pulların yuyulması və terror fəaliyyətinin/terrorizmin maliyyələşdirilməsi üçün istifadə olunan üsullar çox oxşardır və bir çox hallarda eynidir (Katz, 2007). Çirkli pulların yuyulmasına/terrorizmin maliyyələşdirilməsinə qarşı effektiv mübarizə çərçivəsi buna görə də hər iki risk məsələsini həll etməlidir: o, maliyyə sisteminə daxil olan qeyri-qanuni vəsaitlərin və terrorçu şəxslərin, təşkilatların və ya fəaliyyətlərin maliyyələşdirilməsinin qarşısını almalı, aşkar etməli və cəzalandırmalıdır. Həmçinin AML və CFT (Combating the Financing of Terrorism-Terrorizmin maliyyələşdirilməsi ilə mübarizə) strategiyaları birləşir; onlar cinayət və ya terror təşkilatına maliyyə fəaliyyəti ilə hücum etməyi hədəfləyir və cinayət və ya terror şəbəkəsinin müxtəlif komponentlərini müəyyən etmək üçün maliyyə izindən istifadə edirlər (Handoll, 2007). Bu, bütün maliyyə əməliyyatlarını oxumaq və şübhəli maliyyə köçürmələrini aşkar etmək üçün mexanizmlərin işə salınmasını nəzərdə tutur.

Çirkli pulların yuyulması və digər maliyyə cinayətlərinə qarşı mübarizədə beynəlxalq əməkdaşlıq mühüm əhəmiyyət kəsb edir. Cinayətkarlar çox vaxt pulları sərhədlərdən keçirmək və öz fəaliyyətlərini gizlətmək üçün mürəkkəb üsullardan istifadə edirlər ki, bu da hüquq-mühafizə orqanlarının onları araşdırıb təqib etməsini çətinləşdirir (Mitsilegas, Valsamis, Vavoula, 2016). Ölkələr arasında əməkdaşlıq bu çətinliklərin öhdəsindən gəlmək və cinayətkarların aşkarlanma və təqibdən yayınmaq üçün ölkələr arasında AML qanunları və qaydalarındakı fərqlərdən istifadə edə bilməmələrini təmin etmək üçün vacibdir. Maliyyə cinayətlərinin qlobal xarakteri və beynəlxalq maliyyə sisteminin qarşılıqlı əlaqəsi nəzərə alınmaqla bu, xüsusilə vacibdir.

AML-də beynəlxalq əməkdaşlığa nail olmağın bir neçə yolu var: 1. Məlumat mübadiləsi: Müxtəlif ölkələrdəki maliyyə kəşfiyyatı bölmələri (FIU-Financial Intelligence Unit) çirkli pulların yuyulması və terrorçuluğun maliyyələşdirilməsi fəaliyyətlərini müəyyən etmək və izləmək üçün şübhəli əməliyyatlar və maliyyə fəaliyyəti haqqında məlumat mübadiləsi aparır. 2. Qarşılıqlı hüquqi yardım: Ölkələr sübutların paylaşılması və birgə araşdırmaların aparılması kimi maliyyə cinayətlərinin araşdırılması və mühakimə olunmasında yardım göstərmək üçün əməkdaşlıq edirlər. 3. Qanunların və qaydaların uyğunlaşdırılması: Ölkələr cinayətkarların istifadə edə biləcəyi boşluqların olmamasını təmin etmək üçün AML qanunlarını və qaydalarını uyğunlaşdırmaq üçün birlikdə işləyirlər. 4. Potensialın gücləndirilməsi: Daha zəif AML rejimləri olan ölkələr maliyyə cinayətlərinin aşkar edilməsi və qarşısının alınması imkanlarını təkmilləşdirmək üçün daha təkmil sistemləri olan ölkələr tərəfindən dəstəklənir (Obberg, Jacob, 2013).

AML-də beynəlxalq əməkdaşlıq bir ölkənin tətbiq etdiyi sanksiyaların və tədbirlərin digər ölkələrdə effektiv olmasını təmin etmək üçün də vacibdir. Cinayətkarlar tez-tez maliyyə vəsaitlərini dünya üzrə köçürmək üçün qlobal maliyyə şəbəkələrindən istifadə edirlər və sistemdəki zəifliklərdən istifadə etmələrinin qarşısını almaq üçün bir çox ölkənin əlaqələndirilmiş səyi lazımdır

Yekun olaraq qeyd edək ki, beynəlxalq əməkdaşlıq effektiv AML səyləri üçün vacibdir, çünki maliyyə cinayətləri əlaqələndirilmiş cavab tələb edən qlobal problemdir. Birgə işləməklə, ölkələr cinayətkarların aşkarlanma və təqibdən yayınmaq üçün AML qanun və qaydalarındakı fərqlərdən istifadə edə bilməmələrini və qlobal maliyyə sisteminin təhlükəsiz və qeyri-qanuni fəaliyyətdən azad olmasını təmin edə bilərlər. Çirkli pulların yuyulmasına qarşı mübarizənin beynəlmiləlləşməsi Birləşmiş Millətlər Təşkilatının Vyana Konvensiyasının və Bank Tənzimləmələri üzrə Bazel Komitəsinin yaradılması ilə əlamətdar olmuşdur (Ouwerkerk, 2009). Birincisi çirkli pulların yuyulmasının cəza aspektinin beynəlmiləlləşdirilməsinə, ikincisi isə maliyyə sektorlarının çirkli pulların yuyulması məqsədləri üçün istifadəsinə qarşı maliyyə tənzimləmələri prinsipinin beynəlmiləlləşdirilməsinə müraciət edir. BMT-nin Vyana Konvensiyası çirkli pulların yuyulması ilə bağlı beynəlxalq nəzarətin yerləşdirilməsi və beynəlxalq səylər üçün standartın müəyyən edilməsi üçün əsas yaratmışdır. Çirkli pulların yuyulmasının cəza aspektinin beynəlmiləlləşdirilməsi kimi Vyana Konvensiyası hər bir iştirakçı dövləti narkotik vasitələrdən əldə edilən gəlirlərin yuyulmasını cinayət hesab etməyə məcbur etdi. Bu konvensiya hər bir iştirakçı dövlətin bağlı olduğu məcburi səlahiyyətlərə malikdir. Onun əhatə dairəsi çirkli pulların yuyulması üçün predikativ cinayətlər kimi narkotiklərlə bağlı cinayətlərlə məhdudlaşsa da, konvensiya çirkli pulların yuyulması məsələsinin beynəlxalq səviyyəyə qaldırılmasında mühüm rol oynayır (Simonova, 2011).

## Nəticə

"Çirkli pulların yuyulması" söz birləşməsi bizim hüquqi və iqtisadi lüğətimizə yeni daxil olmağa başlasa da, əslində qloballaşan dünyada uzun müddətdir ki, ən çox təhlükə yaradan cinayətlərdən biri hesab olunur. Qeyri-qanuni yolla pul vəsaitlərinin əldə edilməsi və onların toplanması əslində istənilən cəmiyyətin siyasi, iqtisadi, ictimai və sosial həyatına ciddi zərbə vurur (Salmanov, 2007). Odur ki, cəmiyyətdə sosial ədalət prinsipinin bərqərar olunmasını istəyən vətəndaş həm qeyri-qanuni yolla pul vəsaitlərinin və digər varidatın əldə edilməsinə, həm də onun leqallaşdırılmasına qarşı öz imkanları və səlahiyyətləri daxilində amansız mübarizə aparmalıdır. Əlbəttə ki, bunun üçün insanların ilk növbədə, qeyri-qanuni yolla əldə edilən pul, onun leqallaşdırılması yolları barədə maarifləndirilməsinə böyük ehtiyac vardır. Hər bir dövlət müqavilə, saziş və ya qarşılıqlı hüquqi yardım və məlumat mübadiləsi haqqında digər mexanizm əsasında digər dövlətə terrorizm, terror aktları və terror təşkilatlarına aid edilən cinayət və mülki icraat, inzibati araşdırma, sorğular və prosedurlar üzrə mümkün qədər ətraflı yardım göstərməlidir (12). Dövlətlər terrorizmin, terror aktlarının və terror təşkilatlarının maliyyələşdirilməsində təqsirləndirilən şəxslərin öz ərazilərində sığınacaq almasına imkan verilməməsi məqsədilə bütün mümkün tədbirləri görməli, habelə mümkün olduqda həmin şəxslərin ekstradisiyası üzrə müvafiq proseduralara malik olmalıdır.

## Ədəbiyyat

1. Borlini, Leonardo and Montnaro, F. (2017). The evolution of the EU Law against Criminal Finance: The Hardening of FATF Standards within the EU, SSRN Electronic Journal.
2. Directive (EU) 2015/849 of the European Parliament and of the Council of 20 May 2015 on the prevention of the use of the financial system for the purposes of money laundering or terrorist financing, Official Journal of the EU.
3. Directive (EU) 2018/1673 of the European Parliament and of the Council of 23 October 2018 on combating money laundering by criminal law, Official Journal of the EU.
4. FATF. (2012-2020). International Standards on Combating Money laundering and the Financing of Terrorism& Proliferation. Paris, France.
5. Katz, E. (2007). Implementation of the third money laundering directive an overview, Law and Financial Markets Review.
6. Handoll, J. (2007). Capital, Payments and Money Laundering in the EU. Richmond Law & Tax Ltd, Oxford University Press.
7. Mitsilegas, Valsamis and Vavoula, N. (2016). The evolving EU anti-money laundering regime. Maastricht journal of European and comparative law.
8. Obberg, Jacob. (2013). The Definition of Criminal Sanctions in the EU in European Criminal Law.
9. Ouwerkerk, J. (2009). Criminalisation Powers of the European Union and the Risks of CherryPicking between Various Legal Bases: The Case for a Single Legal Framework for EU-Level Criminalisation. Forthcoming in Columbia Journal of European Law.
10. Simonova, A. (2011). The risk-based approach to anti-money laundering problems and solutions. Journal of Money Laundering Control.
11. Salmanov, A.F. (2007). Cinayət yolu ilə əldə edilmiş pul vəsaitlərini və ya digər əmlakı leqallaşdırma əməlinin cinayət-hüquqi təhlili. “Qanunçuluq” jurnalı, fevral.
12. Aleksey Frenkelin açıq məktubu. Kak Tsentral'nyy Bank s otmyvaniyem deneg boretsya (http://bankir.ru/analytics/antilegal/1362444, 23.01.2007).

**Rəyçi: h.e.d. Mirəli Kazımov**

Göndərildi: 16.11.2022 Qəbul edildi: 11.02.2023

DOI: https://doi.org/10.36719/2663-4619/88/62-67

**Rəvan İsparov**
Bakı Dövlət Universiteti
magistrant
revan.isparov444@gmail.com

# MÜASİR DÜNYADA VƏ AZƏRBAYCANDA EKOLOJİ TƏHLÜKƏSİZLİK PROBLEMLƏRİ

**Xülasə**

Bu məqalədə "İnsan Haqları, Ədalət, Konstitusiya" başlığı altında "ətraf mühitdə yaşamaq hüququ" üzərində dayanmaq, bu hüququn konstitusiya mövqeyini qiymətləndirmək və mövcud konstitusiya müzakirələrindəki məsələlərə qısaca toxunmaq istərdim. İlk növbədə qeyd etmək istərdim ki, "insan hüquqları" müzakirələri ümumiyyətlə bu tərifin kontekstində aparılmır.

Şübhəsiz ki, belə bir müzakirə zəruridir və bu sahədə hüquq sistemimizdəki çatışmazlıqlar müasir ehtiyaclar nəzərə alınmaqla aradan qaldırılmalıdır. Tənqid etdiyim şey, insan haqlarını "təqsirləndirilənlərin hüquqları" ölçüsü ilə məhdudlaşdıran müzakirənin dayazlığıdır. Unudulmamalıdır ki, insan hüquqlarının da inkişafı və düzgün həyata keçirilməsi üçün əlverişli bir mühit yaradılmalıdır.

***Açar sözlər:*** *insan hüquqları, ətraf mühit, hüquqi ölçü, konstitusiya, hüquqi təsbit*

**Ravan Isparov**
Baku State University
master student
revan.isparov444@gmail.com

## Environmental security problems in the modern world and in Azerbaijan

**Abstract**

In this article, under the heading "Human Rights, Justice, Constitution", I would like to focus on the "right to live in the environment", evaluate the constitutional position of this right and briefly touch upon the issues in the current constitutional debate.

First of all, I would like to note that discussions on "human rights" are not conducted in the context of this definition at all. Undoubtedly, such a discussion is necessary, and the shortcomings of our legal system in this area must be addressed, taking into account modern needs. What I criticize is the shallowness of the debate, which limits human rights to the "rights of the accused." It should not be forgotten that a favorable environment must be created for the development and proper implementation of human rights.

***Keywords:*** *human rights, environment, legal dimension, constitution, legal establishment*

## Giriş

Son illərdə ekoloji hüququn inkişafı və ekoloji dəyərlərə hüquqi zəmanət verilməsinin nümunələrinin yayılması ilə ətraf mühit, insan hüquqları fəlsəfəsi və üçüncü nəsil insan çərçivəsində qəbul edilən ətraf mühit haqqı mövzusunda müzakirələr illərdir geniş vüsət almışdır. Bunların içərisində ətraf mühit hüququ və ya həmrəylik hüquqları daha çox ön plana çıxır.

UNESCO tərəfindən insan hüququ olaraq qəbul edilən ətraf mühit hüququ üçüncü nəsil insan hüquqları siyahısına əlavə edilmişdir. Sülh hüququ, inkişaf hüququ, bəşəriyyətin ortaq irsindən faydalanmaq hüququ ilə birlikdə qiymətləndirilir. Bu baxımdan seçdiyimiz mövzu müasir dövrümüz üçün olduqca aktualdır.

Ətraf mühit hüququ, ən əsas insan hüququ olan yaşamaq və insan olmaq hüququnun bir uzantısıdır. Bu baxımdan ətraf mühit hüququ, sağlam və balanslı bir şəkildə yaşamaq haqqını və ya insani həyat şərtlərini təhdid edən hər cür ekoloji problemlərə müqavimət göstərməyi və tələb etməyi əhatə edir (David, James, 2018: 319). Tələb etmək hüququ dövlətin hüquqi şəxsinə qarşı irəli sürülsə də, hüququn subyekti olan şəxsə bəzi vəzifələr də qoyur.

Fikrimizcə, ətraf mühit hüququnun həyata keçirilməsində dövlətdən "müsbət hərəkət" gözlənilsə də, "fiziki şəxslər" və "özəl hüquqi şəxslər" də dövlət kimi məsuliyyət daşıyırlar. Bütün bu elementlərin birgə səyləri və məsuliyyətləri ilə reallaşması gözlənilən ətraf mühit hüququ bu səbəbdən Həmrəylik Haqları adı altında təsnif edilir.

Sağlam və balanslaşdırılmış bir mühitdə yaşamaq hüququ olan fərd, belə bir mühitdən faydalanmaq üçün onu qorumaq, inkişaf etdirmək və idarə etməkdən də məsuldur. Burada məqsəd, bütün vətəndaşların ekoloji hüquqlarını həyata keçirə biləcəyi bir mühit hazırlamaq və qorumaqdır (2). Başqa sözlə desək, bütün insan hüquqları üçün ən əhəmiyyətli məhdudiyyət təbiətin qoyduğu məhdudiyyətlərdir.

Fikrimizcə, ətraf mühit hüququnun başqa bir fərqli xüsusiyyəti, faydalananların təkcə bugünkü nəsillər olmamasıdır. Ətraf mühit hüququ indiki kimi gələcək nəsilləri də narahat edir. Gələcək nəsillər də ətraf mühit hüququna tabe olduqları zaman, bugünkü nəsillərin ən əhəmiyyətli borcu yaşanacaq bir mühiti gələcək nəsillərə təhvil verməkdir.

Bundan əlavə, Konstitusiyanın 78-ci maddəsində aşağıdakı müddəa var: "Hər kəs ətraf mühiti qorumalıdır". Hər kəs bu prosesdə ətraf mühitlə qarşılıqlı əlaqə qurur. Sağlam ətraf mühit hüququndan başqa, hər kəs ətraf mühiti qorumaq məsuliyyətinə malikdir. Ətraf mühiti qorumaq və ona qayğı göstərmək hər kəsin mənəvi borcudur (3).

Sağlam bir mühitdə yaşamaq hüququ insanın əsas hüququdur. Sağlam mühit hüququ ilk dəfə 1972-ci ildə Birləşmiş Millətlər Təşkilatının Stokholm Ətraf Mühit Konfransında müzakirə edilmişdir. Hökumətlərarası işçi qrupu iclasa hazırlıq olaraq Ətraf Mühit Bəyannaməsinin ilk layihəsinə aşağıdakı qaydanı daxil etməyi təklif etmişdir: "Təhlükəsiz və sağlam bir mühit hüququ, yaşamaq hüququ da daxil olmaqla, əsas insan hüquqlarından biridir" (4).

İnsanın ən vacib haqqı yaşamaq haqqıdır. Bu hüquq ümumbəşəri və məcburidir. Onsuz başqa hüquqlar mənasızdır, yəni yaşamaq haqqı yoxdursa, heç bir hüquq mövcud ola bilməz. Halbuki qanunla nəzərdə tutulmuş bəzi hallarda beynəlxalq hüquq müharibə vaxtı düşmən əsgərinin öldürülməsinə, yəni həyatdan məhrum edilməsinə icazə verir, digər hallarda isə yaşamaq hüququ ən qiymətli hüquqdur (4).

Ətraf mühit bu hüquqla sıx bağlıdır. Yəni insan sağlam mühitdə yaşamaq hüququndan istifadə edir. Hər kəs təbii bir mühitdə yaşamaq istəyir. Müasir dövrdə sağlamlıq hüququ bir-biri ilə sıx bağlıdır və dəyişməyə ehtiyac yoxdur. Amerika qanunları, məsələn, bir çox ştatın qanununda "ana bətnində olsa belə, yaşamaq hüququnun qorunması lazım olduğunu" ifadə edir.

Araşdırmamızdan məlum olur ki, İngiltərədə aborta qadağa qoyaraq kilsə ana bətnində yaşamaq hüququnun da qorunması lazım olduğunu xəbərdar edir. Bu hüquqla yanaşı, hətta bəzi ölkələrin qanunlarında belə, yemək haqqı, sağlamlıq hüququ, düzgün yaşayış şəraiti, təhlükəsiz iş şəraiti və s. bu hüquqla sıx əlaqədə olduğu da qeyd edilir (2).

Amerika İnsan Haqları Konvensiyasında deyilir: "Hər kəs bu cür müdaxilə və hücumlara qarşı qanunun qorunması hüququna malikdir". Hər kəsin fiziki və zehni sağlam olmaq hüququ vardır. Məsələn, Avropa Şurasına üzv olan ölkələr yalnız səhlənkarlığa səbəb olan və ya səhlənkarlıq üzündən ağır yaralananların məsuliyyətə cəlb oluna bilməsi ilə razılaşmırlar. Bu cür hərəkətlərə beynəlxalq hüquqi qiymət verilməsini dəstəkləyirlər.

Dövlətlər, ümumilikdə, beynəlxalq ictimaiyyət qarşısında, insan həyatı üçün ekoloji təhlükələrin qarşısının alınmasında və təsirindədir. Hər bir dövlət, eləcə də Birləşmiş Millətlər Təşkilatı (Ətraf Mühitin Mühafizəsi Proqramı), təhdid və təhlükələri meydana gəlməzdən əvvəl müəyyən etmək üçün xüsusi müşahidə və erkən xəbərdarlıq sistemləri yaratmalıdır. Həyatı təhdid edən fəlakət haqqında məlumat alan ölkələr bu barədə Birləşmiş Millətlər Təşkilatına məlumat verməlidir (5).

